HAFİZ ŞİRAZİ

# SEÇİLMİŞ ŞEİRLƏR

"ÖNDƏR NƏŞRİYYAT"
BAKI-2004

*Bu kitab "**Hafiz Şirazi**. Seçilmiş şeirlər" (Bakı, Azərnəşr, 1967) nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*

Tərcümə edəni: **Əbülfəzl Hüseyni**

Müqəddimə, qeydlər və lüğətin müəllifi: **Əkrəm Cəfər**

**891.55 - dc 21**
**AZE**
**Hafiz Şirazi. Seçilmiş şeirlər.** Bakı, "Öndər nəşriyyat", 2004, 208 səh.

Şöhrəti İranda və onun sərhədlərindən uzaqlarda yayılmış Hafiz Şirazinin yaradıcılığı orta əsrlər farsdilli lirik poeziyanın zirvəsidir. Şairin lirikasında ənənəvi mey və məhəbbət mövzuları aparıcı yer tutur. Hafiz məhəbbətin timsalında həyatı, yaşamağın sevinclərini tərənnüm edir. Onun əsərlərindəki rind obrazı cəmiyyətin eybəcərliklərinə qarşı dayanan məğrur, azadfikirli şəxsiyyət səviyyəsinə yüksəlir. Bu mənada Hafiz poeziyasının ən qabarıq cəhəti ondakı etiraz ruhudur.

Şairin Divanı fal açmaq vasitəsinə çevrilmişdi ki, bu da dünya ədəbiyyatında bənzəri olmayan bir hadisədir. Hafizin qəzəlləri Azərbaycanda da geniş yayılmış, hətta onların peşəkar ifaçıları (hafizxanlar) olmuşdur.

Oxuculara təqdim olunan bu kitabda böyük söz ustasının yüzdən artıq qəzəli, saqinamələri, bir məsnəvisi, qırxdan çox rübaisi, səkkiz qitəsi və üç yüzə yaxın seçmə beyti toplanmışdır.

**ISBN 9952-416-41-4**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**"Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında"**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir

## HAFİZ ŞİRAZİ VƏ ƏSƏRLƏRİ

Şəmsəddin Məhəmməd Hafiz Şirazi İran ədəbiyyatının Firdovsi, Xəyyam, Sədi ilə yanaşı duran və dünya ədəbiyyatının qızıl fonduna daxil olan ən böyük şairlərindən biridir. Firdovsi epik, Xəyyam fəlsəfi, Sədi hakimanə-moralist janrın böyük ustadı olan kimi, Hafiz də lirik janrın misilsiz ustadıdır. Onun əsərləri əsrlərdən bəri Yaxın və Orta Şərq xalqlarının sevə-sevə oxuduqları, əzbərlədikləri, öz dillərinə tərcümə etdikləri, onlara nəzirələr yazdıqları, şərh və tədqiq etməyə çalışdıqları ölməz əsərlərdir.

XVII əsrin türk satirik və qəsidəçi şairi Nəfi deyir ki:

Hafizü İbnyəminəm qəzəlü qitədə, gər
Söyləsəm bəlkə rübaidə olardım Xəyyam.

Gördüyümüz kimi, məğrur şair Nəfi də İran ədəbiyyatında qəzəl dedikdə ən başda Hafizi qeyd edir və özünü böyütmək üçün Hafizlə müqayisə edir. Hafiz isə qəzəl ustadı Sədini hesab edir:

Ustad-e qəzəl Sədist nəzd-e həmə kəs

(hər kəsin nəzərində qəzəlin ustası Sədidir) deyir. Bu etirafda, əlbəttə, həm həqiqəti ifadə etmək, həm öz böyük sələfi qarşısında qədrşünaslığını bildirmək, həm də təvazökarlıq vardır. Doğrudur, Sədi istər məzmun, istərsə forma etibarilə yüksək tipli qəzəlin İran şerində banisidir, onun ən gözəl nümunələrini XIII əsrdə Sədi vermişdir. Lakin Hafiz XIV əsrdə qəzəl sənətini farsdilli ədəbiyyatda ən yüksək mərhələsinə qaldırmışdır. Onu Şərqdə də, Qərbdə də bütün dövrlərin və bütün xalqların ən böyük lirik şairlərindən biri sayırlar.

Hafizin doğum və ölüm illəri haqqında məlumat mənbələrdə müxtəlifdir. Həqiqətə yaxın olanı budur ki, o 1300-cü ildə Şirazda doğulmuş və 1389-cu ildə orada da vəfat etmişdir. Məqbərəsi Şiraz hasarının xaricində, güllü-çiçəkli Müsəlla dağındadır.

Hafizin atası Bahaəddin isfahanlı olmuş, gənclikdə Şiraza köçmüş, kasıb bir adam olmuşdur. Hafiz uşaq ikən atası ölmüşdür. Uşaq çox zəhmətsevər və istedadlı olduğundan yaxşı təhsil almışdır. O, eyni zamanda ərəb ədəbiyyatını da yaxşı öyrənmişdir. Təhsilini bitirdikdən sonra Şiraz məktəblərinin birində müəllimlik etmişdir. Şair XIV əsrin 30-40-cı illərində sufilərin dərvişlər silkinə daxil olmuşdur, lakin mürşidinin kim olduğu məlum deyildir.



Hafiz bütün ömrünü Şirazda keçirmişdir. Məlumdur ki, o bir dəfə İsfahana getmiş, orada qala bilməyib Yəzdə köçmüş, Yəzd də ona xoş gəlməyib, tez Şiraza qayıtmışdır.

Hafiz Şirazi şeir yazmağa daha gənc ikən başlamışdır. Çox çəkmədən bu sahədə parlaq istedadı ilə şöhrət qazanmışdır. Dövrün hakimləri onu saraya dəvət etmişlər.

Hafizin həyatının ilk yaxşı dövrü şah Şeyx Əbu İshaq İncunun sarayında keçmişdir. Onun dövründə fars əyalətində Müzəffərilər hakimiyyət sürürdülər. Müzəffərilərin ikinci hökmdarı Şah Şüca da Hafizi sarayına dəvət etmişdir (Şah Şüca özü də şair olmuşdur). Hafiz bir müddət bu sarayın sevimli şairi olmuşdur. Sonra məzhəb xadimlərinin fitnəsilə Şah Şüca Hafizi saraydan xaric etmişdir. Bu dövrdə Hafiz bir sıra əsərlərində taleyinin pisliyindən şikayət edir. Şirazda vəziyyət dözülməz olmuş, İsfahana və Yəzdə getməsi də həmin dövrdə olmuşdur. Bu zaman Hafizi qonşu ölkələrin hakimləri öz saraylarına dəvət etmişlər. O cümlədən Sultan Əhməd Cəlayiri neçə dəfə onu görmək arzusunda olmuşsa da, şair bu təklifləri qəbul etməmişdir. O, vətəni Şirazın Müsəlla Gülgəştini və Rüknabadini hər yerdən çox sevdiyi üçün vətəninə qayıtmışdır.

Rzaqulu xan Hidayətin yazdığına görə Teymurləng Şirazı zəbt edərkən, Hafizlə görüşdüyü zaman şairin paltarı çox köhnə imiş. Bununla əlaqədar bir rəvayət də məşhurdur. Guya Hafizin:

Əgər on tork-e şirazi bedəst arəd del-e mara
Bexal-e hinduyəş bəxşəm Səmərqəndu Buxarara.

(Əgər o şiraz türkü (gözəli) mənim qəlbimi ələ gətirsə, onun qara xalına Səmərqənd ilə Buxaranı bağışlaram) beyti olan şerini Teymur oxumuş, bərk qəzəblənmiş, Hafizi çağırıb demişdir: "Mən dünyanı fəth etdim ki, Səmərqənd ilə Buxaranın şöhrətini bütün aləmə yayım, sən nə cürət edirsən mənim ən gözəl şəhərlərimi bir qara xala verirsən?" Hafiz cavab verir: "Ey dünyanın fatehi, mən elə deməmişəm, demişəm ki, əgər o gözəl qəlbimi ələ gətirsə, onun qara xalına se mən qəndu (uç batman qənd) və do xurmara (iki xurma) bağışlaram". Guya Teymur Hafizin bu hazırcavablığından xoşlanmış və soruşmuş: "Doğrusunu söylə, əgər o şəhərlər sənin olsaydı, o gözələ bağışlardınmı?" Hafiz bunun cavabında: "Əgər mən var-yoxumu gözəllərə bağışlamasaydım, bu günə qalardımmı?!" – deyərək köhnə paltarını Teymura göstərmişdir.

Görünür ki, böyük şair maddi cəhətdən yoxsulluq və ehtiyac içində yaşamışsa da, ruhən zəngin, mənəviyyatca həmişə yüksəkdə olmuşdur. Bunu biz onun bir şerində xüsusən aydın görürük:

Dərvişəm-o, gəda-vo bərabər nə mikonəm
Pəşmin kolah-e xiş besəd tac-e xosrəvi.

(Dərvişəm ya dilənçiyəm, amma gecə papağımı yüz padşah tacına dəyişmərəm).

Hafiz Şirazinin ədəbi irsi ona dünya şöhrəti qazandırmış olan məşhur divanından ibarətdir. Əsərlərinin ən mühüm qismi onun qəzəlləridir. Bunlardan əlavə o başqa janrlarda da bir sıra əsərlər yaratmışdır. Qəzəllərinin sayını dəqiq göstərmək çətindir. Seyid Əbdürrəhim Xəlxalinin tənqidi mətnində ("Divan-e Xacə Hafez Şirazi", Tehran, 1928) şairin 496 qəzəli, Hüseyn Pəjmanın tənqidi mətnində ("Divan-e Xacə Şəmsəddin Məhəmməd Hafez Şirazi", Tehran, 1939) 581 qəzəli göstərilmişdir. Bunlardan başqa bir sıra qəzəllər də var ki, Hafizə mənsub olub-olmadığı şübhə altındadır.

Hafiz özü öz əsərlərini toplayıb divan şəklinə salmamışdır. Şairin dostu Məhəmməd Güləndamın dediyinə görə, Hafiz dövrünün müxtəlif elmləri ilə çox məşğul olduğundan əsərlərini cəmləyib kitab kimi tərtib etməyə imkan tapmamışdır. Onun əsərlərini ilk dəfə toplayıb divan şəklində tərtibə salan azəri şairi Şah Qasım Ənvər olmuşdur (vəfatı 1434). Lakin Hafizin divanı XVIII əsrin sonuna qədər yalnız əlyazmalar şəklində mövcud olmuşdur. Birinci dəfə bu qiymətli kitab şairin ölümündən dörd əsr sonra, 1791-ci ildə daşbasma ilə Kəlkuttada çap edilmiş, ancaq ondan sonra bu əsər İranda, Hindistanda, Türkiyədə, Misirdə yüz dəfədən çox nəşr edilmişdir.

Hafiz Şirazinin əsərlərini Qərb şərqşünasları da öyrənməyə çalışmışlar. Avropa XVIII əsrin ortalarından bəri Hafizlə maraqlanır. XVIII-XIX əsrlərdə onun əsərləri Qərbin müxtəlif dillərində dəfələrlə nəşr edilmişdir. Almanca nəşrlərinin birində Hafiz şerinin şəkilləri də (qəzəl, məsnəvi, rübai, müxəmməs), ingiliscə nəşrlərinin birində şəkillərlə bərabər onların vəznləri də saxlanmışdır.

Qərbdə Hafizin pərəstişkarlarından biri məşhur alman mütəfəkkir şairi Y.V.Gete olmuşdur. Məlumdur ki, Getenin yüzlərlə Şərq şairi arasında özündən böyük saydığı yeddi şairin biri Hafiz Şirazidir. Deyirlər ki, Gete Hafizi Avropa üçün kəşf etdi. Şərqşünas P.-Hammer Hafiz divanının almanca bütöv tərcüməsini verəndən sonra Gete Hafizi tanıdı və öz məşhur "Qərb-Şərq divanı" adlı əsərini nəşr etdi; Hafizi bütün dünyaya tanıtdı. Gete bu əsərində yazırdı: "Ey böyük Hafiz, sənin qəzəl demək üsulunu ürəkdən təqlid etmək



istəyirəm! İstəyirəm ki, öz şerimi sənin söz incilərinlə bəzəyəm. Əvvəlcə məzmun tapmaq, sonra ona gözəl libas geyindirmək xəyalı ilə yaşayıram!.. Sənin şeir qanunlarını öyrənmək, ona riayət etmək istəyirəm! Bunu ona görə istəyirəm ki, bəlkə sənin kimi bir şeir deyə biləm, ey dünya şairlərinin şairi!"

Hafizi dünyaya bu qədər sevdirən amillər onun əsərlərindəki yüksək sənətkarlığı və böyük bəşəri ideyalarıdır. İnsan və onun – sevgi duyğuları, gözəl və onun məlahəti, eşq və onun zövqü, şərab və onun nəşəsi, təbiət və onun sonsuz gözəllikləri, bahar və onun gətirdiyi fərəh, səfa – bunlar Hafiz şeirlərinin baş mövzularıdır. Əlbəttə, bu mövzuları çox şairlər tərənnüm etmişlər, fəqət Hafizin bunları tərənnümü, onun sənətindəki xüsusi şeriyyət misilsizdir. Onda ayrı bir fəsahət, ayrı bir dad, ayrı bir ətir vardır.

Hafizin şeirlərində olan bu fövqəladə, bu dərin bədii təsir qüvvəsi şairin uzun illər boyu çəkmiş olduğu böyük səbirli əməyin nəticəsində əldə edilmişdir. O özü bu xüsusda deyir:

İn həme şəhd-o şəkər gəz soxanəm mirizəd
Əcr-e səbrist kəz on şax-e nəbatəm dadənd.

(Bütün bu bal-qənd ki, mənim şerimdən axır, səbrin, əməyin məhsuludur ki, əkdiyim ağacda bitmişdir).

Hafiz əsərlərinin dil və sənətkarlıq gözəllikləri arxasındakı ictimai ideyalar çox incə yollar və mənalı surətlərlə ifadə edilmişdir. Bu ideyaları asanlıqla qavramaq mümkün deyildir. Şərqdə Hafiz divanının o qədər təsiri və nüfuzu olmuş ki, onun daxili mənalarını anlamaq üçün ona farsca, türkcə, urduca bir sıra şərhlər yazmalı olmuşlar.

Bəzi Şərq alimləri şairin ideyalarını mistik mənada təhlil, onun insani eşqini ilahi eşq kimi izah edirlər. Həqiqətdə isə Hafizdə Xəyyamın epikürizmi, yəni həyata nikbin baxaraq, ondan zövq və ləzzət almaq həvəs və arzusu ilə yaşamaq qayəsi açıq surətdə ifadə olunur. Lakin insanların belə bir səadətli həyata çatmalarına cəmiyyətdəki qara qüvvələr mane olur. Hafizin əsərlərində yalançı şeyxlər, zalım hökmdarlar və onların məmurları olan möhtəsiblər tənqid olunur.

Prof. Y.Ripkanın təsdiq etdiyi kimi, Hafiz türkcəni (demək, azəricəni) bilirdi. O zaman Şirazın şah sarayında türk dilini bilirdilər. Bundan görünür ki, Hafizin dilində təkrar olunan "türk", "türkan" sözləri yalnız "gözəl" mənasında deyil, həm də doğrudan-doğruya həqiqi, etnik mənada işlənmişdir.

Hafiz fars dilində yaradan azəri şairlərindən, xüsusən Nizamidən və Övhədidən təsir və ilham almış, bu şairlərin ikisini də yüksək qiymətləndirmişdir. O, "Saqinamə"sində yazır ki:

"Bu köhnə dünyada Nizami kimi gözəl söz söyləyən olmamışdır. Onun şerindən burada üç beyt təzmin edirəm[1]. Nizaminin bu sözləri ağıllı adamların nəzərində ən bahalı incilərdən də dəyərli və yaxşıdır".

Bu sözləri deyən Hafiz Nizaminin "İskəndərnamə"sindən üç beyt alıb əsərinə daxil edir. Burada biz bilavasitə Hafizin öz dilindən eşidirik ki, o, Nizamini bütün şairlərdən yüksək tutur və onun əsərlərini ən bahalı incilər kimi qiymətləndirir.

Hafiz, Marağalı Əvhədini piri-təriqət (mənəvi rəhbər) sayır. O, oxucusuna deyir ki: "Sənə bir nəsihət verim, yadında saxla və ona əməl et. Bu nəsihət piri-təriqətimdən yadımda qalıbdır. Əsası boş olan bu dünyada doğruluq, əhdə vəfa axtarma. "Bu qoca dünya min adaxlının gəlini olmuşdur". Dırnağa alınan cümlə Əvhədinin bir misrasıdır ki, Hafiz onu öz qəzəlinə keçirmişdir. Hafiz yaradıcılığı ilə Əvhədi yaradıcılığı arasında oxşarlıq nöqtələri çoxdur. Hafiz Əvhədidən yalnız təzmin deyil, bir sıra iqtibaslar da etmişdir. Hafiz Divanının tənqidi mətnini tərtib etmiş H.Pəjman deyir ki, "Hafizin üslub tərzi dil cəhətdən Əvhədiyə çox yaxındır". Bunun nəticəsidir ki, katiblər Övhədinin bir sıra qəzəllərini Hafizin divanına salmışlar.

Hafizin fars şerindəki mövqeyi azəri şerində Füzulinin mövqeyi kimidir. Şərqin bu iki dahi şairi, biri farsca, biri azəricə qəzəl sənətinin ən böyük ustalarıdır. Misilsiz lirizm, dərin səmimiyyət, musiqili dil, yüksək sənətkarlıq və bütün bunların xidmət etdiyi bəşəri ideyaların tərənnümü hər iki şairi birləşdirən keyfiyyətlərdir.

Hafiz azəri şairlərini qiymətləndirdiyi kimi azəri alim və şairləri də Hafizi sevmiş, onun əsərlərinə və sənətinə böyük qiymət vermişlər. Azərbaycanda hətta müxtəlif peşəkarlar arasında da Hafiz pərəstişkarları və hafizxanlar, onun əsərlərini ömür boyu oxuyanlar olmuşdur.

Məhəmməd Hadi və Sabir Hafizin "Baş", "Qəm məxur" kimi bəzi şeirlərini azəricəyə tərcümə etmişlər. Əlbəttə, bunlar heç də kafi deyildir.

Bu kitaba Hafizin qəzəlləri, saqinaməsi, məsnəvisi, rübailəri, qitə və seçmə beytləri salınmışdır. Şeirlərin mütərcimi Əbülfəzl Hüseyni Həsrətdir. Əlbəttə, tərcümə nöqsansız deyildir, lakin Hafizin şerini orijinaldakı bədii səviyyəsilə başqa dildə vermək çox çətindir. Şair Əbülfəzl Hüseyni bu işdə böyük əmək sərf etmiş və deyə bilərik ki, Hafizin bir sıra şeirlərini müvəffəqiyyətlə tərcümə etmişdir.

***Əkrəm Cəfər***

[1] Təzmin şərqşünaslıqda bir şairin başqa şairdən misra, beyt, parça alaraq öz əsərinə salmasına deyirlər.



# Qəzəllər

***

Əla ya əyyühəssaqi, gətir cam ilə mey əldə,
İşim müşküldədür, rəhm et ki, eşq aldatdı əvvəldə.

Səba əsdikcə zülfündən ətirlər saçdı dünyayə,
Könüllər bənd olub qaldı əsir tək qara teldə.

Boya səccadəni meylə, desə piri-müğan hər gah,
Müsafir nabələd olsa, yəqin ki, mat qalar çöldə.

Harayla səslənən zənglər deyir: durma, gedir karvan,
Necə mən şad olum indi nigarımla bu mənzildə?

Gecə zülmət, əsir yellər, gəmim girdabə düşmüşdür,
Nə anlar dərdimi bir kəs oturmuş olsa sahildə?

Bütün bu gördüyüm işlər məni bədnam edər axir,
Məgər gizlin qalar bir söz, gəzərsə nəğmə tək dildə?

Nigarı görmək istərsən, onu tərk eyləmə, Hafiz,
Ki, məqsəddən kənar olmaz, nəzər heç mərdi-kamildə.

* * *

Könlüm gedir əlimdən, rəhm eylə sən, xudaya!
Ey dad! Məxfi sirrim oldu cahanda ifşa.

Cəhd eylə doğru yol get, məxluqə yaxşılıq et,
Viranədir bu aləm, əfsanədir bu dünya.

Əyləşmişik qayıqda, qalx, ey külək, dayanma,
Ta bəlkə bir də çatdıq dildarə, aşinaya.

Gül şaxəsində bülbül xoş səslə dad edirdi:
Ey məst, ayıl, səhərdir, gün nur saçır səmaya.

Qalmaq üçün səlamət, ey sahibi-kəramət,
Gəl eylə bir səxavət dərvişi-binəvaya.

Saxlar iki cahanı iki sözün bəyanı:
Dosta mürüvvət eylə, düşmənlə et müdara.

Biz çatmadıq vüsalə, batdıq qəmə, məlalə,
Sən dözməsən bu halə, təğyir ver qəzaya.

İskəndər ayinəsi cami-Cəmə nəzər sal
Onlar desin ki, indi qalmış hayanda Dara.



* * *

Daşdan da olsa qəlbin dilbər əlində mumdur,
Dikbaşlıq etmə şam tək, salma özün bəlaya.

Mütrüb, de xoş nəfəslə, bu şeri incə səslə,
Min vəcd ver həvəslə hər piri-parisaya.

Sufi qızıl şərabə ümmülfəsad söylər,
Dur, ver, səfa gətirsin ta gül ətirli səhba.

Səy et ki, dar günündə mina ola önündə,
Dünya verər piyalə, Qarun deyər gədaya.

Farsi kəlamla türklər ruha qida verirlər,
Sən pirə xoş xəbər ver, saqi, daha dayanma.

Zahid, bağışla, Hafiz əynindəki qabanı
Qoymaz bata cahanda heç rəngə, heç riyaya.

* * *

Yusifi axır alar ağuşə Kənan, qəm yemə,
Gül açar bir gün yenə solmuş gülüstan, qəm yemə.

Pozma sən əhvalını, bu yarəli məftun könül,
Eylər öz dərdinə, əlbəttə, dərman, qəm yemə.

Meylimizlə dönmədi uç gün əgər çərxi-fələk,
Daimən bir halda qalmaz heç də dövran, qəm yemə.

Bir də gəlsə gülşənə ömrün baharı, bülbülün,
Yar olar mütləq sənə gül özlü canan, qəm yemə.

Naümid olma, könül, min bir oyun var pərdədə,
Sirrlər çoxdur hələ xilqətdə pünhan, qəm yemə.

Qəm əlində kim əsirdir yarsiz, dildarsiz,
Söylə ki, qəmxar olar axir bir insan, qəm yemə.

Kəbeyi-məqsəd dalınca sən piyadə vur qədəm,
Min tikan tutsa yolu, yorsa biyaban, qəm yemə.

Qalmışıq dildarə həsrət, kam alır zalım rəqib,
Eybi yoxdur, məhv olar axırda hicran, qəm yemə.

Bu fəna seyli əgər dünyaları viran edə
Nuh rəhbərdir gəmində qopsa tufan, qəm yemə.

Baxma yol dəhşətlidir, məqsəd nəzərlərdən uzaq,
Hansı müşkül olmayıb axırda asan? Qəm yemə.

Söyləmə, Hafiz, mənə bəsdir dua Quran ilə,
Sidq ilə olsan əməldə sən müsəlman, qəm yemə.



* * *

Əgər ol türki-şirazi, bizə lütf etsə pünhanı,
O hindu xalinə verrəm Səmərqəndi, Buxaranı.

Gətir, saqi, içək badə, kənar ol ahu həsrətdən,
İnan cənnətdə tapmazsan bu gül açmış Müsəllanı.

Fəğan bu şəhrə min qovğa salan duzlu gözəllərdən!
Alıblar könlümü əldən, necə türk adlı yəğmanı.

Bizim bu natəmam eşqin nədir nəfi gözəl yarə,
Bəzərmi rəngilə bir kəs məgər gülşəndə Rənanı?

Bilirdim Yusifin hüsnü tükənməz iqtidar ilə,
Ki, rüsva eyləyər bir gün cahan içrə Züleyxanı.

Acı sözlər şirin ləbdən mənimçün nuş olur, cana.
Onun tək şəhdü şəkər yox, dolansan külli dünyanı.

Qulaq as, bir sözüm vardır, cahandidə həkiməm mən,
Cavanlar can ilə dinlər həmişə sözdə mənanı.

Danış sən meylə mütrübdən, burax əsrarı dünyadə
Ki, xilqətdə açan yoxdur əzəldən bu müəmmanı.

Qəzəldir söylədin, Hafiz və ya dürrilə gövhərdir,
Gərək göylər nisar etsin ona zər tək Süreyyanı.

* * *

Hayanda var belə bir mübtəlası hicranın?
Çürütdü ömrümü zülmü, cəfası hicranın.

Özüm qərib, köməksiz, fəqir, əsir, aşiq,
Yıxar məni bu amansız bəlası hicranın.

Düşə mənim əlimə, öldürəm haman saət,
Edəm bu göz yaşımı qanbahası hicranın.

Hara gedim, nə edim, dərdimə nə çarə qılım
Nə eyləyim ki, verilsin cəzası hicranın?

İnanmıram ki, çıxam ayrılıq kəməndindən,
Görünməyir bu qara intəhası hicranın.

Sevəydi hicr səni, bir düşəydi hicranə,
Biləydi təkcə ölümdür dəvası hicranın.

Deyin, fəraq hara, mən hara, bu dərd hara,
Əzab üçün məni doğmuş anası hicranın?

Gülündən ayrı dönüb qanə Hafizin bağrı,
*Gəlir çəməndə həmişə nəvası hicranın.*



* * *

Üz qoymuşuq yolunda sənin dərdü möhnətə,
Biganəyik cahanda, riyayə, rəzalətə!

Hindu saçında könlümüzü etmişik əsir,
Can gözlərin önündə durub başla xidmətə.

Dünyanı tutmadıq qoşun ilə, qılıncla biz,
Göz dikmədik o səltənətə, tacə, dövlətə.

Bir guşədə ümidlə hilal axtaran kimi,
Görmək üçün o qaşları gəldik bu xəlvətə.

Nərgiz gözün bu qəm dolu sevdalı başımı,
Salmış bənövşətək dizimin üstə heyrətə.

Yük etmədik cahan qəmini qəlbə heç zaman,
Qurban olub həyatda nə varsa məhəbbətə.

Məstanə gözlərin görək axir nə sehr edər,
Bağlandı ömr ondakı cadulu afətə.

Tağı, rəvaqı, mədrəsəni, qilü qalı biz
Etdik fəda o camilə, saqilə işrətə.

Hafiz, qalıb həyanda o məcnun könül, dedi,
Salmış, dedim, kəməndlə zülfün əsarətə.

* * *

Yenə od rəngi çöküбdür gülümün surətinə,
Hansı qəmgin ürəyin od vurub o, xilqətinə?!

Aşiqi məhv edərək aləmə tufan salmaq,
Elə dondur ki, biçilmiş onun öz qamətinə.

Üzünün nuru ilə zülfü çalıb din evini,
Afərinlər o zərif tellərinin qüdrətinə!

Ürəyim bir elə qan yığdı, gözüm səpdi yerə
Kim qazandı necə, kim xərclədi öz möhnətinə.

Yari dünyayə satan mənfəət etməz heç vaxt,
Yusifi hərrac edənlər nə alıb qiymətinə?

Yandırır canımı cananım üzərrik yerinə,
Dəyməyə ta ki, yaman göz onun ülviyyətinə.

Söylədi: nazım ilə mən səni məhv eyləyərəm,
Var ümidim bu sitəmlərlə yenə ülfətinə.

Dedi, yandır ki, yaraşmır sənə, Hafiz, bu əba!
Əhsən o incə görən gözlərinin diqqətinə.



* * *

Şükür Allahə, açılmış yenidən meyxanə,
Vuralım badələri işrətilə məstanə.

Küplərin qəlbi şərab ilə bu gün cuşə gəlib,
Bir həqiqətdir o mey, sanmayınız əfsanə.

Nə qədər cəfa, nazinə qurban olalım,
Biz vəfa etməliyik əcz ilə şux canana.

Zülfünün tərifini müxtəsər etmək olmaz
Qısa etmək bu sözü sığmayacaq imkanə.

Məcnunun qəm yüküdür zülfü gözəl Leylanın,
Mahmudun qəlbi Ayaz ilə dönüb al qanə.

Yummuşam gözlərimi aləmə şahin kimi mən,
Görmüşəm ta üzünü, könlüm olub divanə.

Açmadıq qeyrə biz əsrarı, nihan saxlamışıq,
Dosta izhar eləyək, çünkü deyil biganə.

Küçəni Kəbə bilib, kim gələ sidqilə ora,
Səcdə eylər qaşına əldə qızıl peymanə.

Hafizin qəmlərini şəmə deyin şərh eləsin,
O bilir odda nə cür yandı yazıq pərvanə.

* * *

Dedim, xəta elədin eşqdə, gözəl canan,
Dedi, qəza belə vermiş əzəl mənə fərman.

Dedim ki, Tanrı səni vəsl ilə edib xoşbəxt,
Dedi, mən istəməmişdim bu cür vüsal ondan.

Dedim, səni bu günə pis müsahibin salmış,
Dedi ki, taleyimə yoldaşam əzəl başdan.

Dedim, nə oldu ki, kəsdin mənimlə ülfətini?
Dedi, fələk əli ilə düşür qara hicran.

Dedim, çox içmisən, içmə bu son piyaləni sən,
Dedi, sonuncu piyalə olur qəmə dərman.

Dedim ki, ah gözəl ömrüm, nə tez ötüb getdin?
Dedi, qonaqlığının vaxtını bilir mehman.

Dedim, nədir qara xətlər sənin üzündə, dedi,
Cahanı tərk eləmək əmridir yazıb dövran.

Dedim, günəş üzünü görmüşəm səhər tezdən,
Dedi, duam bu idi sübhədək səmalardan.

Dedim, bir az da dayan lütf elə, aman getmə!
Dedi, bu cür tələb eylər, heyif ki, dövrü zaman.

Dedim ki, Hafizi tərk etməyə nədir illət?
Dedi, bu barədə etdim mən əhd ilə peyman.



* * *

Gəldi gül fəsli, gəlin gülşənə işrət eləyək,
Pirimiz böylə deyib, əmrinə hörmət eləyək.

Yoxdur heç kəsdə kərəm, zövqü səfa vaxtı keçir,
Səcdəni tərk eləyib badəyə beyət eləyək.

Bu gözəl fəsldə, yarəb, bizə bir yar yetir,
Ta baxıb gül üzünə könlümüzü məst eləyək.

Ərğənunsazı fələk düşmən edibdir sənətə,
Hamı birlikdə gəlin biz ona nifrət eləyək.

Gül açıb, yarpağına səpməmişik badə hələ,
Qoy vuraq başımıza dərd ilə riqqət eləyək.

Lalənin camını gülşəndə xəyalən içirik,
Mütrübə çatmayır əl, qoy belə adət eləyək.

Bülbülük, güllər içində dilimiz bağlı qalıb,
Hafiza, söylə, bu dərdi kimə söhbət eləyək?

* * *

Qələmdə yox elə dil ki, gələ bəyanə fəraq,
Gələrdi yoxsa əlimlə bu dastanə fəraq.

Xiyalü səbrilə daim bu yolda həmsəfərik,
Kədərlə, qəmlə gətirdi bizi fəğanə fəqət.

Vüsal arizusilə ömür tamam oldu,
Nə hicr çatdı sona, ey haray, aman! Nə fəraq.

Həyatda göylərə də başımı mən əyməz idim,
Sitəmlə qamətimi döndərib kəmanə fəraq.

Nə cür qanadlanım o vəslinin həvasında,
Ki, qırdı qol-qanadı, tökdü aşiyanə fəraq.

Sınar ömür gəmisi, qərq olar bu dəryadə,
Bu cür vurur ki, onu hey o yan, bu yanə fəraq.

Fələk əsir elədi eşq əlində könlümüzü,
Gətirdi səbrimizi dar başında canə fəraq.

Nə çarə etmək olar, – yol uzaq, dəniz tufan, –
Ki, səbr yelkənini qırdı zalimanə fəraq.

Nə cür deyim çataram vəslinə bu möhnət ilə,
Qəza qədərlə verir hökmi-hakimanə fəraq.

Əzəldə kaş, ilahi, qara olaydı üzü
Gələn zamanda bu hicranilə cəhanə fəraq.

Yetərsə vəslə biri, Hafiza, aman verməz
Ki, hicr üçün tapa bir də yeni bəhanə fəraq!



* * *

Olmuşam eşqində mən aləmdə suzan şam kimi,
Rindlərlə əyləşib ağlar gözüm qan şam kimi.

Mum olub səbrim dağı qəmlər əlində, ey sənəm!
Düşmüşəm ta odlara hər yerdə hər an şam kimi.

Ay camalın olmasa ömrüm-günüm olmuş gecə,
Eşq odundan tapmışam hər dəmdə nöqsan şam kimi.

Səbrimi sap tək kəsibdir qəmlərin bir qayçı tək!
Yandırır atəş kimi zülmətdə hicran şam kimi.

Axdı sel tək göz yaşım sürətlə daim çöhrədən,
Qoymadı sirrim qala könlümdə pünhan şam kimi.

Bilmərəm röya nədir məstanə tək aləmdə mən,
Olmuşam hicrin qəmilə xəstə, giryan şam kimi.

Odla su tutmuşsa da ətrafımı, sabit durub,
Atmaram sevdanı mən əsla başımdan şam kimi.

Mən şəbi-hicrandayam, pərvanə qıl öz vəslini
Yoxsa ki, şöləm edər dünyanı viran şam kimi.

Nurunu saçmaq üçün eyvanıma, ey məhliqa,
Çöhrəni göylərdə et şövqilə taban şam kimi.

Sübh tək sənsiz fəqət bir dəm qalıb ömrüm mənim,
Gəl edim öz canımı vəslində qurban şam kimi.

Eşqini bir şölə tək Hafiz alıb öz başına,
Göz yaşıyla qoymaz o olsun pərişan şam kimi.

* * *

Hər işi, hər əməli, ləl-şəkər barı şirin,
Xəlq edib xilqət əzəldən o gözəl yarı şirin.

Gül kimi incə ləbi, sərv kimi nazlı boyu,
Bir lətafətli çiçək tək hamı rəftarı şirin.

Könlümü şad eləyir, zülfü səmən yarpağı tək,
Hüsn bağındakı hər meyvəsi, hər barı şirin.

Şivəsi, nazı şirin, çahi-zənəxdanı şirin,
Qaş-gözü, al yanağı, sinədəki narı şirin.

O xumar gözlərinə canımı qurban edərəm,
Bizə bu dərdlər ilə etdi o rüxsarı şirin.

Eşqinin selləri hərçənd kəsib qarşımızı,
Gedirik vəslə gedən qorxulu yolları şirin.

Bu fəna yollarını tutsa da min dərdü bəla,
Hafiz ümmidlə gedir dilbərinə sarı şirin.



* * *

Eşq edib könlümü al qan ki, soruşma!
Od vurub halıma hicran ki, soruşma!

Seyr edib küllü cahanı neçə dəfə,
Tapmışam bir elə canan ki, soruşma.

Sel axır dövrbərindən o nigarın,
Ah, bizim göz yaşımızdan ki, soruşma.

Mən eşitdim qulağımla, o danışdı,
Elə sözlər, elə dastan ki, soruşma.

Ayrılıq dərdini çəkdim gecə-gündüz,
Oldu könlüm evi viran ki, soruşma.

Baxma öylə qəzəbilə deməرəm mən,
Öpmüşəm gül dodaqdan ki, soruşma.

Eşq üzündən yenə Hafiz bu cahanda,
Tapdı bir mərtəbə, bir şan ki, soruşma.

* * *

Gəlin ki, qəsrimizin payəsi olub viran,
Gətir o badəni ki, durmadan keçir dövran.

Bu göy çadırlı cahanda o kimsənin quluyam
Ki, hər nə rəngü riya var kənar olub ondan.

Nəsihət eyləyirəm, dinləyib əməl eylə
Ki, pirimiz bu yolu öz əlilə verdi nişan.

"Min ərli köhnə gəlindir əcuzə dünyamız"![1]
Bu əyribeldə görünməz düz əhdinə peyman.

Dünən gecə mənə meyxanədə xəbər gəldi,
Açım, dedi, sənə mən eyləyim bu sirri əyan:

Ki ey səma quşu tərlan, deyil sənə layiq
Bu dərdli-qəmli, bəlalı xərabə köhnə cahan!

Dayanma gəl sənə bir səs deyir səmalərdən,
Nə düşmüsən bu tora, qalmısan belə heyran!

Cahanda qəm yemə heç vaxt, eşit nəsihətimi,
Deyib bu sözləri bir gün ağıllı bir insan.

Düyünləmə qaşını, alnını açıq saxla
Ki, sirrlər qapısı bağlıdır bizə hər an!

Gülün üzündə təbəssüm deyil çəməndə müdam,
Dayanma, bülbül, ucalt sən ürəkdən ah-fəğan!

Həsəd aparma gəl, ey təbi süst, bu Hafizə sən,[2]
Alıb o, ilhamını lütfilə səmalardan.

[1] Bu misra Əvhədi Marağalınındır.
[2] Bu misra Əvhədi Marağalınındır.



* * *

Mey gözəl, mina gözəl, xoş ətrli reyhan gözəl,
Məst üçün məstanəlik, məstanəyə canan gözəl.

Ruh verir nazlı səba öz ətri ilə qəlbimə,
Xoş nəfəsdən qüvvət alsa can olar hər an gözəl.

Gül xəzan olmuş çəməndə açmadan bir balü pər,
Nalə qıl, ey qəmli bülbül, qəmliyə əfğan gözəl.

Müjdələr olsun sənə, ey haq deyən haqqın quşu!
Nəğmələr qoşmaq üçün eşq əhlinə hicran gözəl.

Gəz cahan bazarını, heç kimdə şadlıq qalmayıb,
Rindliklə ömr elə keçməzsə bu dövran gözəl.

Mən süsəndən dinlədim gülşəndə, söylərdi belə:
Yük əgər yüngül olarsa, yol gedər karvan gözəl.

Tərk edib var-dövləti, Hafiz, keçir əyyamı xoş,
Sən demə ömr eyləyir dünyadə o sultan gözəl.

* * *

Dünən səfərdəki yardan xəbər verib yellər,
Verim bu könlümü mən də yelə görüm neylər.

Baxanda qəlbim əsirdi ləbin xəyalı ilə,
Çəməndə öz telini titrədən zaman güllər.

Görəndə nərgisin o tacını fəğan etdim,
Ərəqçinində, dedim, qıvrılıb qara tellər.

Gecə çırağla, səhərlər küləklə həmsirrəm,
Fəqət yayır sözümü aləmə bütün ellər.

Səhər nəsimi gətirdi vüsal müjdəsini,
Onun əliylə açıldı ürəkdə müşgüllər.

Bu gün göründü gözümdə nəsihətin əsəri,
İlahi, şad ola daim görüm şirin dillər.

Mənim vüsal gecəsi könlümə şəfəq yağdı,
Unutmaram o dəmi keçsə də uzun illər.

Təmiz ürəklə yetişdin mürədə, ey Hafiz.
Təmiz ürəklilərə dəyməsin qara əllər.



* * *

Saqi, şərab nurunu gəl süz bu camıma,
Bir nəğmə de, müğənni, yetişdim məramıma.

Gördüm düşüb piyaləyə əksi nigarımın,
Ey bixəbər, o şəhd çatıbdır təamıma.

Dildar nazı baş çəkib əflakə sərv tək,
Tərifi bilmirəm necə sığsın kəlamıma.

Ölməz cahanda kim ki, vurur qəlbi eşqlə,
Eşqin kitabı zamin olubdur dəvamıma.

Zahid həlal, mən də həram ilə məşğulam,
Çatmaz onun həlalı mənim bu həramıma.

Badi-səba, nigar bağından keçəndə sən,
Ərz et ki, iltifat eləsin bu pəyamıma.

Bir gün gələr, adım da yadından çıxar sənin,
Heç olmasa cəvab ver indi səlamıma.

Qəlbim tutuldu sərv həvasilə lalə tək,
Ey bəxt, rəhm elə yetir axır məqamıma.

Baxdıqda ay, qayıq kimi göylərdə qərq olub,
Əhsən deyək bu şənilə hacı Qəvamıma.

Hafiz, bir əşg danəsi səp, vüslətin quşu,
Lütfilə bəlkə də qona bir ləhzə damıma.

* * *

Göz yaşın ümman edib, səbri qovum səhrayə,
Könlümü mən belə işdə çevirim dəryayə.

Dərdli, möhnətli ürəkdən elə bir ah çəkim.
Ta ki, odlar vurum o Adəm ilə Həvvayə.

Oxlayıb qəlbimi əflak, gəlin məst eləyin,
Bir düyün mən də vurum göydəki o Covzayə.

Bir qədəh badə səpim təxtinə bu dövranın,
Cəng avazını salsın bu yaşıl minayə.

Qəlb o yerdə şən olur ki, ola dildar orda,
Eylərəm cəhd çatam mən elə bir məvayə.

Ey üzü ay gözəlim, lütfə gəlib, rəhm eylə,
Ta başım düşsün o zülfündə sənin sevdayə.

Arxalanmaq belə əyyamə xətadır, Hafiz,
Qoymaram mən bu günün eyşi qala sonrayə.



* * *

Bir dənə meyvə dərəm mən o bağından, nə olar?
Nur alam bircə gecə şah çirağından, nə olar?

Kölgəsində o yaşıldon ucaboy sərvin əgər
Baş əyib fəxrlə öpsək ayağından, nə olar?

Yaralı könlümüzü naz ilə odlara yaxan,
Dərman etsən ona öz gül yanağından, nə olar?

Ömrü sərf eyləmişəm yar ilə, meyxana ilə,
Tozlu-torpaqlı məçidlər bucağından nə olar?

Eşqinin badəsi dünyadə məni ölməz edib,
Vahi bir abi-həyatın bulağından nə olar?

Məskən etdim özümə dilbərimin kuçəsini,
Zahidin verdiyi cənnət sorağından nə olar?

Bildi aşiqliyimi xacə mənə söz demədi,
Hafizi qovma sən öz vəsl bağından, nə olar.

* * *

Faş edib sirrimi, oldum dediyimdən dilşad,
Eşqə qul olmaq edibdir məni daim azad.

Gülşəni-qüds quşuydum, nə deyim hicrandan
Ki, nə cür burda məni bəndə vurubdur səyyad?!

Mələk idim, vətənim nazlı gözəl cənnət idi,
Gətirib saldı bu viranəyə Adəm, ey dad!

Tərk edib huriləri, cənnəti, Tubanı tamam,
Vəslinin eşqi ilə oldu könül onlara yad.

Nəqş edib sinəmə dildarın əlif qamətini,
Başqa söz, mən nə edim ki, deməyibdir ustad.

Heç münəccim tanımaz taleyimin ulduzunu,
Bəs nə taleylə anam doğdu məni, ey bidad!

Eşq meyxanəsinə qul olalı aləmdə
Ürəyimdə yeni qəm dəmbədəm eylər fəryad.

Qəlbimin qanını içməkdədir öz göz bəbəyim,
Nə şikayət ki, özüm yarımı etdim cəllad.

Hafizin göz yaşını sil, gözəlim, zülfün ilə,
Yoxsa bu sellər ömür qəsrini eylər bərbad.



* * *

Aşiqləri bəlayə saldı gözəl camalın,
Bənd etdi işvə ilə min qəlbi qarə xalın.

Hicrində, sən bilərdin, aşiqlərin nə çəkmiş,
Gəlsəydi yoxlamaqçın heç olmasa xəyalın.

Yox qəmlərin hesabı, saqi, gətir şərabı,
Ancaq odur əlacı bu dərd ilə məlalın.

Gül dövrü kef zamanı, zövqü səfa içində
Tutmaq gərək əlindən sən qaşları hilalın.

Canan ayağın öpmək olsa sənə müyəssər,
Artar o şahdan artıq, Hafiz, sənin cəlalın.

* * *

Get öz işində ol sən, zahid, nədir bu fəryad!
Mən könlümü itirdim, sən etmə dad-bidad!

Fəryadımız kəsilməz bir ney kimi dodaqdan
Bu sinə dağlarından biz olmayınca azad.

Xəlq olcağın qaplandı əsrarı bu cahanın,
Açmaz onu həyatda heç tərzilə bir ustad.

Şahdan cəlalı çoxdur qarşındakı gədanın,
Çünki sənin yolunda olmuş həyatı bərbad.

Saqi, gətir şərabı, viranə qıl bu qəlbi,
Meysiz nəyə gərəkdir mənzil olarsa abad?

Etmə, könül, şikayət öz yarının əlindən,
Zülmi nəsibin etmiş, qılmaz dübarə imdad.

Hafiz, qədəhlə şad ol, əfsanədir bu dünya,
Burdan köçüb gedəndə kim eyləyər səni yad?



* * *

Qarşımda cami-badə, məclisdə nazlı canan,
Kimdir mənim yanımda, gəlsə bu dəmdə sultan?

Söndür çirağı getsin, dildarımın cəmalı
Zülfün içində ay tək məclisdə oldu taban.

Hərçənd ki həlaldır dinimdə badə, ancaq
Sənsiz həramım oldu, ey saçları pərişan!

Fikrim qara xalında, gözlər əqiq ləbində,
Könlümsə həsrətinlə hicranda oldu al qan.

Rədd eylə bu gülabı, yox ehtiyac ətrə!
Zülfünlə sən edibsən dünyamızı gülüstan.

Qəndlə şəkər nə lazım, kimdir ona xəridar?
Dildar bal ləbindən şəhd eyləyibdir ehsan.

Qəmlər səni yıxanda, axtar, əlacı vardır,
Mən meylə daim etdim hər odlu dərdə dərman.

Qəm etmərəm həyatda, könlümdə kölgə yoxdur,
Mərdanədir həmişə, vicdan pak olsa, insan!

Meysiz, gözəlsiz olma, cənnət budur bizimçün,
Sanma gedib taparsan köçdükdə sən həyatdan!

Darğa məni güdür ki, məstəm şəhərdə aşkar,
Altun alır bu işdən, daim içir o pünhan.

Hafiz, çağır nigarı, çıx seyrə laləzarı,
Məst ol, oturma, qafil, verməz aman bu dövran.

* * *

Gəl, gəl, gözəlim, lütfilə bir an mənə can ol,
Yan halimə könlüm kimi sinəmdə nihan ol.

Aç şişəni, doldur qədəhi, sevgili saqi!
Sonra bu cahan mülkünə söylə, ramazan ol.

Tərk eylə, gülüm, dini, geyin rind libası,
Pak qəlbin ilə cəhd elə məşhuri-cahan ol.

Söylər gözəlim ki, nigəranəm, mənə rəhm et,
Axır gələrəm, gözlə, əzizim, nigaran ol.

Ey qəlb, qan etdi səni o ləbləri yarın,
Dilbər belə istər, nə olar, səbr elə, qan ol.

Silməkçin ürəkdən gülümün dərd-qubarın,
Ey göz yaşı, ax sel kimi sən, üzdə rəvan ol.

Hafiz ki deyir: Cami-Cəm olsun mənə könlün,
Ey qəlb, onun xatirinə cümlə cahan ol.



* * *

Yad edib aşiqini nazlı nigarım bu gecə!
Allah, Allah, yenə də gəldi o yarım bu gecə!

Görcəyin qaşlarını səcdə edib baş əyirəm,
Çatdırıb aşiqini kamına Tanrım bu gecə.

Bəxtimin gülşəninə vəsli çiçək səpdi onun,
Ömrümə verdi səfa tazə baharım bu gecə.

"Haq" yazar axsa qanım zülm ilə Mənsur kimi,
Haqdan ayrı nə olar başqa şüarım bu gecə?!

"Leylətül-qədr" kimi telləri keçmiş əlimə,
Sığmayır dünyalara dövlətü varım bu gecə.

Xonçanın örtüyünü açmağı qəsd eyləmişəm,
Məni öldürsə də o çeşmi-xumarım bu gecə.

Mən fəqirəm, gözəlim, sənsə gözəllər şahısan,
Busə lütf eylə ki, yox əldə qərarım bu gecə.

Hafiza, başdakı sevda səni məhv eyləyəcək
Şam kimi şölə saçan ah-şərarım bu gecə.

* * *

Gördüm o yarı dünən, məstü xuraman getdi,
Tərk edib meykədəni, halı pərişan getdi.

Söylədim, munisi-can, getmə, bizə rəhm elə sən
İncimişdi ürəyi, baxmadı, canan getdi.

Bəlkə Xarəzmilə Ceyhunu salıb xatirinə,
Atdı öz şahlığını sanki Süleyman getdi.

Bir də kimdir ki, onun tək sözə qiymət versin
Getdi, əfsus! Bədəndən elə bil can getdi.

Yalvarıb söylədim, ey yar, fəqirəm, nəzər et,
Baxmadı halətimə lütf ilə sultan, getdi.

Bilməyib hörmətini, qəlbinə dəydik deyəsən,
Baxdı aşiqlərinə, gör necə peşman getdi.

Tökdü göz yaşlarını sel kimi getdikdə nigar,
Hafizin qəlb evini eylədi viran, getdi.



* * *

Bayram gəlib bahardır, saqi, gəl əldə badə,
Gül fəsli heç olarmı mey olmaya arada?

Könlüm tutuldu, eyvah, saqi, gətir şərabı,
Rədd eylə ki, səfa yox bu rəng ilə riyadə.

Vaiz dünən şərabı xəlqə həram edirdi,
Təqvasını bu gün o, badəylə verdi badə.

Gülşəndə ta ki, gül var, gəl sən də şadlıq eylə,
Qoy iltifatə gəlsin saqi də sadə-sadə.

Məclisdə, heç bilirsən, bircə nə ləzzət eylər,
Rəqs eyləyə arada mütrüb əlində badə.

Güllər solur kədərlə, gəl-gəl, gözəl nigarım!
Dilləndir o rübabi çatsın fərəhlə dadə.

Bir nəğmə de, müğənni, Hafiz qəzəllərindən,
Şayəd ki, zövqə gəlsin məclisdə şahzadə.

* * *

Gəl, gəl desən, əzizim, lütfün bizə şirindir,
Get-get desən də hərgah fərman yenə sənindir.

Fəryad o qaşla gözdən, tərifi əqlə gəlməz,
Vəsfində söz danışmaq, ey nazənin, çətindir.

Eşqin göziylə ancaq görmək olar nigarı,
Çünki bulud içində gün üzlü bir gəlindir.

Şərh eyləmək olarsa dildarı bir söz ilə,
Öz hüsnüdür bu xoş söz ancaq, həmin həmindir.

Hafiz kimi şeirdə düşmən də məntiq istər,
Tərlanla sərçə uçmaz, əlbəttə, bu yəqindir.



* * *

Çulğayıbdır qəməri qarə dumanlar, görürəm,
Göy üfüqlər tutulub, qırmızı qanlar görürəm.

Hamı xoş gün diləyir, çatmayır öz mətləbinə,
Qəmlə viranə qalan xeyli məkanlar görürəm.

Məst olub nemətilə ağlı sönük nadanlar,
Əhli-elmə baxıram, ahü fəğanlar görürəm.

Eşşəyin boynuna bağlandı qızıl tuq bu gün,
Cins atın qismətini köhnə palanlar görürəm.

Ana ilə vuruşur gör necə də qız balalar,
Ataya sillə vuran çoxlu cavanlar görürəm,

Baxmayır qardaşa qardaş, elə bil məhşərdir,
Atadan da balaya xeyli ziyanlar görürəm.

Hafizin sözlərini dinlə, çəkin pislikdən,
Onda dünyayə dəyən dürlü bəyanlar görürəm.

***

Ay üzlü dilbərinə eyləyir dua Hafiz,
Əgərçi ömrü boyu çox görüb cəfa Hafiz.

Yanaqları eləyibdir əgərçi bağrını qan,
Ləbindən istəyir öz dərdinə dəva Hafiz.

Görüb qara xalını bəndə düşmə zülfündə,
Sənə kifayət edər düşdüyün bəla, Hafiz.

Dayanma, fəsli-bahardır, gəl, ey gözəl saqi,
Sevir çəməndə görə yar ilə səfa Hafiz.

Visalə çatmaq üçün yox ümid imkanı,
Gözəllərin şahısan, neyləsin gəda Hafiz?

Verər hədiyyə kimi könlünü gözəl yarə,
Çatarsa vəslə əgər dərdə mübtəla Hafiz.

Götür rübabi ələ, bir gözəl qəzəl söylə,
Bu dərdli qəlbimə ver şerilə şəfa Hafiz.



***

İç, şərabilə dağıt dərdi, bəlanı, məhəni,
Qəm əlindən ala bilsə, alacaq badə səni.

Qəlbi şad eylə müdam mey dolu bir cam kimi,
Küp kimi palçığa batmaqla çürütmə bədəni.

İç şərabı o qədər ki, unudub öz-özünü,
Bəlkə mən-mən deməyib, tərk edəsən sən bu "mən"i.

Badə iç, bəlkə bir az könlünə cürət gətirə,
Dini, imanı atıb, ta yıxasan Əhriməni.

Torpaq ol sən də təvazölə bulud danəsinə,
Gül-çiçəklərlə bəzə sinədəki boş çəməni.

Canını eylə fəda yarına Hafiz kimi sən,
İstəsən qəlbin ola nazlı nigarın vətəni.

* * *

Saqiya, lütf elə şərab gətir.
İki-üç cam şərab nab gətir.

Dərdi-eşqin davası meydir, mey!
Nədir ayrı bizə cavab? Gətir!

Ay meyin camıdır, mey isə günəş,
Mah içində sən afitab gətir.

Demə dövran gedir, gedir, getsin,
Nəğmə çal sazilə, rübab gətir.

Ağlımız baş alıb qaçır bizdən,
Badədən boynuna tənab gətir.

Gəl su səp qəlbimin alovlarına,
Nə olar eylə bir səvab gətir.

Gül gedir, gəl deyək ki, xoş gəldi,
Badə ver, ətr səp, gülab gətir.

Qumri bağdan gedirsə qoy getsin,
Yenə təkrar edək, şərab gətir.

Ya xətadır və ya səvab içmək,
Ya xatadır və ya səvab gətir.

Bəlkə röyada vəslə çatdıq biz,
Yuxuya eylə bir xitab, gətir.

Mən ki məstəm, bir az da məst eylə,
Cam ver, ta olum xərab, gətir.

Dolu ver Hafizə qızıl camı!
Eylə, durma, bir inqilab gətir.



* * *

Zülfi-müşkindən sənin hər dəm bəla getdi ki, getdi,
Hər xalından bizlərə min bir xəta getdi ki, getdi.

Yandırıb məhv eylədi eşq atəşi can mülkünü,
Gördü şahin zülfünü, axır, gəda getdi ki, getdi.

Saqiya, mey ver bizə yoxdur təriqətdə cidal,
Hər küdurət çevrilib oldu səfa getdi ki, getdi.

Eşqdə möhkəm dayan, məftun könül, dağlar kimi,
Sel təkin tüğyan edib cövrü cəfa getdi ki, getdi.

Kim ki, söz gəzdirdi ondan yüz cürə zillət gələr,
Həmnişin naəhl idi, oldu fəna, getdi ki, getdi.

Xanigahi tərk edibsə, Hafizə eyb etməyin,
Çünki azaddır ayağı, zahida, getdi ki, getdi.

* * *

Gözəl Şirazımın yoxdur misalı,
Uzaq qıl, yarəb, ondan hər zəvalı.

O Rüknabadinə əhsən, yüz əhsən!
Ki, Xızr ömrü verir xalqa zülalı.

Gözəldir Cəfərabadü Müsəlla,
Nəsimi məhv edər dərdi, məlalı.

Lətif bir ruhu sən Şirazdan istə,
Nişan versin elin əqli, kamalı.

Misir qəndindən orda söhbət açma
Ki, şəkkər yağdırır hər gül cəmalı.

Səba, gəl yarımızdan bir xəbər ver,
Nə cürdür haləti, xoşdurmu halı?

Məni röyadan, ey Tanrı, ayırma
Ki, şad etmiş onun şirin xəyalı.

Əgər öldürsə xoşdur nazlı yarım,
Könül söylər qanım olmuş həvalı.

Səni, Hafiz, yaman incitdi hicran,
Neçin tərk eylədin bilməm vüsalı?



* * *

Bu cahandan bizə bir sevgili canan bəsdir,
Bu çəməndən bizə bir sərvi-xuraman bəsdir.

Mən riya əhli ilə ülfəti qət eyləmişəm,
Mey ilə olsa əgər dostluğa imkan, bəsdir.

Qəsri-Firdovs əməl sahibinin qismətidir,
Bizə bir meykədə bəxş etsə də dövran, bəsdir.

Çağlayan çaylara bax, ömrünü sən sal yadına,
Eyləsə böylə tamaşa səni heyran bəsdir.

Seyrə dal aləmi, bazarini, azarini gör,
Etdi əhvalımızı qəmlə pərişan, bəsdir!

Yar ki, bir çöldə gəlib lütf ilə yar oldu bizə,
Həmnəfəs olmaq üçün bir belə ceyran, bəsdir.

Öz qapından məni sən cənnətə göndərmə, gülüm,
Bura aləmdə bizə, canına qurban, bəsdir.

Vəsldir könlümüzü şad eləyən dünyadə,
Bu təmənna bizə, ey saçları reyhan, bəsdir.

*Hafiza, etmə şikayət ki, nədir qismətimiz,*
Olmusan böylə qəzəl mülkünə sultan, bəsdir.

* * *

Zülfünü vermə yelə, verməyəsən badə məni,
Nazını etmə bina, yıxma bu dünyadə məni.

Aç sən öz çöhrəni, ta tərk eləyim gülzarı,
Etmə möhtac boyunla uça şümşadə məni.

Zülfünə həlqə vurub könlümü sən salma tora,
Ağladıb həsrət ilə boğma bu dəryadə məni.

Olma məşhur şəhərdə, məni sən salma dağa,
Etmə Şirinlik ilə tay o Fərhadə məni.

Qeyr ilə badə içib, qəlbimi qan eyləmə gəl,
Ayrılıb qəmlə gətirmə belə fəryadə məni.

Vəslinə çatmayır əl, düşdüm ayaqdan, rəhm et,
Söyləmə sən ki, – çağırma daha imdadə məni.

İncimez Hafiz, əzizim, bu qədər zülmündən,
Bəndə vurmaqla gülüm, eylədin azadə məni.



* * *

Həftə yoxdur ki, ayım getdi, mənə bir ildir,
Ayrılıq sən nə bilirsən ki, necə müşküldür!

Gözlərim şəklini çöhrəndə görüb ayna kimi,
Qara xalını, dedi, bu, ya ki yanan bir güldür?

Ey səxavətlə şəhərdə hamıya hatəm olan,
Mən qəribdən, nə üçün bəs ürəyin qafildir?

Süd damır bal dodağından, təzə bir körpədir o,
İşvədə kirpiyinin hər biri bir qatildir.

Cövhəri-fərdə, gülüm, eyləmirəm şübhə daha,
Çünki ağzın bu zərif nüktə üçün təkmildir.

Muştuluq gəldi ki, yar yad edəcək aşiqini,
Böylə bir xeyr işə qəlbin nə zaman mayildir?

Dağ qədər dərdə nə cür səbr eləsin Hafiz ki,
Qocalıbdır, qocalıq şərhi uzun təfsildir.

* * *

Baxdı mehrabə könül, qaşlarını yad elədi,
Səcdəni tərk qılıb dad ilə bidad elədi.

Ayrılıq dərdinə yoxdur daha taqət məndə,
Səbrimin mənzilini qəm seli bərbad elədi.

Doldurun camı, çəmən geydi yaşıl paltarını,
Eşq kaşanəsini zövqilə abad elədi.

Saçdı xoş ətrini dünyayə gözəl istiqbal,
Gəldi gül fəsli sınıq qəlbimizi şad elədi.

Verdi ziynət özünə hicledə sənət gəlini,
Gəldi damadı onu qüssədən azad elədi.

Baxma təhqir ilə Yusif o Züleyxayə sarı,
Eşq yıxdı evini, şövkətinə yad elədi.

Ziynət ilə bu gözəllər belə məhvəş görünür,
Rəngsiz hüsnü mənim dilbərimin dad elədi.

Əydilər başlarını barlı ağaclar bağda,
Sərv azadə gəlib ayrıca bir ad elədi.

Hafizin şerini, mütrüb, oxu tar ilə bu dəm,
Ki, ötən günləri könlüm yenidən yad elədi.



* * *

Namə ilə qələmin ta ki bizi yad eylər,
Elə bil yüz qul alıb hər dəfə azad eylər.

Qoy qədəm gözlərim üstə, deyin o qasidinə,
Gəlişi çünki bizim könlümüzü şad eylər.

Bir şirin sözlü, qara gözlü, gözəllər şahıdır,
Hüsnü aşiqləri bu dəhrdə Fərhad eylər.

Ox atıb gözləri işvəylə kaman qaşlardan,
Eşq kaşanəsini qəhrilə bərbad eylər.

Hacəti yox belə tərifə sənin surətinin,
Bir gözəllik ki, təbii ola o, dad eylər!

Nə olar ki, yetirə vəslinə dildar məni,
O ki, hər bir yetənə lütf ilə imdad eylər.

Zahidin ömrü boyu etdiyi təkbirə dəyər,
Kim sınıq bir ürəyi mehr ilə abad eylər.

Çatmadı mətləbə Hafiz vətəni Şirazda,
İndi salmış yadına Bağdadı fəryad eylər.

* * *

Ey səba, gəl güzər eylə Arazın sahilinə,
Öp gözəl vadisini, şəhpərini sər çölünə.

Səs salır dağlarına qafilələr zəngi müdam,
Ehtiram ilə salam et o böyük mərd elinə.

Söylə canane ki, hicran məni məhv etmədədir,
Tut əlimdən, nə olar, can ola qurban əlinə.

Mey içib işrət elə bir gecə ta sübhə kimi,
Lütf ilə çək əlini qəmzəli yarın telinə.

Çeşmi-məstini görüb el qəlbini sən eylə nisar,
Canını eylə fəda eşq ilə şirin dilinə.

Pirimin sözlərinə bilməyib əfsanə dedim,
Düşmüşəm indi, nə etmək ki, bəlalər selinə.

Kam alır ney şəkərindən oturub tutilər,
Başına döymədə milçək ki, qonum sünbülünə.

Aşiq olmaq diləsən verməlisən öz başını
Yoxsa eşqin topunu vurma həvəs mənzilinə.

Yada salsa qələmi Hafizi dildarımızın,
Şənlənib körpə uşaq tək düşəcək süd gölünə.



* * *

Gəlməz saya bu şəhrin canlar alan nigarı,
Rəhm eylə işvəkarım, yox könlümün qərarı.

Bir kimsə görməyibdir böylə sevimli afət!
Bir ovçu salmayıbdır heç bəndə bu şikarı!

Güldə, çiçəkdə yoxdur ləlindəki lətafət,
Qoyma ona ki, heç vaxt qonsun ələm qubarı.

Qovma məni qapından, bir busə mərhəmət qıl,
Pay almağa gədanın yoxdurmu ixtiyarı?

Dildar ilə, mey ilə çıx seyrə laləzarı,
Bəlkə görəmmədik heç bir də gələn baharı?

Hal əhli badə ilə gülşəndə gül içində,
Məstanə işrət eylər, qoynunda nazlı yarı.

Bir sirrli qıfıldır dünya əzəl binadan,
Əsla tapılmayıbdır bu sandığın açarı.

Şux türklərin əlində Hafiz giriftar oldu,
Tərk eyləmək gərəkdir tezliklə bu diyarı.

***

Nə badə idi ki, saqi gətirdi məstanə,
İçirtdi, bizləri etdi bu növ divanə?

Qəm etmə, qönçə kimi bağlısan sən, ey könlüm,
Düyün açan gələcəkdir bizim gülüstanə.

Gül ilə yasəmənin gəlməsi mübarəkdir,
Bənövşə ilə səmən xoş gəlib bu bostanə.

Özün əlac elə gəl dərdimə sən, ey saqi,
Nə ehtiyac daha bir təbibə, dərmanə?

Şirin xəbərlə yetişdi səba çəmənzarə,
O cür ki, hüdhüd apardı xəbər Süleymanə.

Müğənni hansı məqam üstə bir nəva oxudu
Ki, söz içində neçə söz dedi o cananə?!

Götür şərabı çəkil dilbərinlə səhrayə,
Amandır, olma, gülüm, növbəharə biganə.

Sevimli pirimizə, zahida, müridəm mən
Ki, sən behişt verirsən, o isə meyxanə.

Fəda olum mən o türkə, yamanca dargöz imiş,
O şənilə mənə donluq gətirdi bir danə.

Fələk qul olmalıdır Hafizə bu saətdə
Ki, həmdəm oldu sənin tək vüqarlı sultanə.



***

Səhər-səhər fələyin xəlvəti otağından
Yananda Şərq şamı nurə qərq olar hər yan.

Üfüq bu dəmdə cibindən çıxardar aynasını
Açar gözəl üzünü saxlamaz həyat pünhan.

Fərəh evində yenə Cəmşidin bu aləmdə
Çalarkən ərğənunu Zöhrə qaldırar əfğan.

Harayla cəng deyər: harda qaldı bədbinlər,
Qədəh gülər ki, hanı xalqı aldadan nadan!

Baxıb bu halə götür mey dolu piyaləni sən,
Bu tərz ilə dolanıbdır həmişə bu dövran.

Saçı bəla yuvası bir nigardır dünya,
Yəqin ki, arif olan ondan ötrü salmaz qan.

Həmişə badəni, Hafiz, gül üzlü yar ilə iç,
İki cahanda tapammaz bu dövləti insan.

* * *

Yetişdi müjdə ki, qəmdən nişanə qalmayacaq,
O cür ki, qalmadı, dövran bu cür də qalmayacaq.

Nigarımın nəzərində əgərçi xar oldum,
Rəqibə də tapılar bir bəhanə, qalmayacaq.

Qovur yenə qaravullar qılınc ilə hamını,
Yəqin hərəmdə biri məhrəmanə qalmayacaq.

Gətir fəqirin ələ könlünü sən, ey sultan,
Gedər əlindən, inan, bu xəzinə qalmayacaq.

Səhər yaxındadır, ey şəm, atəşin sönəcək,
Məhəbbət eylə sən öz aşinanə, qalmayacaq.

İşarət eylədi qeybin sürüşu lütf ilə
Ki, heç kəsə ürəyi zalimanə qalmayacaq.

Yazıblar ərşə qızıl xəttilə: bu dünyadə
Gözəl əməl qalacaq, başqa heç nə qalmayacaq.

Sarayda Cəmşid oxurmuş həmişə məstanə:
Gətir piyaləni saqi, zəmanə qalmayacaq.

Nə pisdən inci, nə də yaxşıdan xəcalət çək,
Qəm ilə eyşdən əsla nümunə qalmayacaq.

Nigar mərhəmətindən əl üzmə, ey Hafiz,
Həmişə qəlbi o cür zalimanə qalmayacaq.



* * *

Ülvi gözəl behiştdir xəlvəti dərvişlərin,
Bir fəxrdir salikə xidməti dərvişlərin.

Tilsim sayılmış əgər guşənişinlik özü,
Olmuş onunçün açar hümməti dərvişlərin.

Tərifi tutmuşsa da yer üzünü cənnətin,
Rövnəqdən salmış onu izzəti dərvişlərin.

Guya qızıl eyləyir hər bir şeyi kimiya,
O kimiyadır, gəlin, söhbəti dərvişlərin.

Açmaz niqab üzündən gün göydə xiclətindən,
Dünyayə nur saçanda surəti dərvişlərin.

Aləm boyu tükənməz bəxş olsa yüz əl ilə!
Gövhər dolu dəniz tək sərvəti dərvişlərin.

Hökm edirsə cahanda hər hakim bir şəhərdə,
Əflakə hakim olmuş qüdrəti dərvişlərin.

Var-dövlətin dalınca şahlar qaçar həmişə
Bəxşiş olub əzəldən adəti dərvişlərin.

Qarun xəzinəsilə birlikdə batdı-getdi,
Daim qalar həyatda dövləti dərvişlərin.

Sultan olub əgərçi *Asəf bu gün sarayda*
Hakimdir o qəsrinə hikməti dərvişlərin.

Baş əy bu yerdə, Hafiz, şahü gəda təmamən
Baş əydi qulluğunda həzrəti dərvişlərin.

* * *

Göz yaşımdan qorxuram könlüm evi viran ola,
Sirrimiz aləmlərə faş olmağa şayan ola.

Daş, deyirlər, səbrilə bir gün gələr yaqut olar,
Bəli, mümkündür bu iş, qəlbin gərək ki, qan ola...

Dərd əlindən istərəm məskən edəm meyxanəni,
Ta sönə qəm atəşi, müşküllərim asan ola.

Sərv tək qəddin əcəb baş qaldırıbdır göylərə,
Bir də əl vermək ona müşkül deyil imkan ola.

Bir gözəllik qəsrinin ki, sən kimi sultanı var,
Can gərək, ey nazənin, hərdəm sənə qurban ola.

Hər tərəfdən ox kimi min bir dua göndərmişəm.
Məqsədə çatmaq üçün bəlkə birində can ola.

Həsrətindən hüsnünün soldum, saraldım zər kimi,
Torpağı dürr eyləyər hümmət ayın taban ola.

Dərdimi ərz et nigarə, bilməsin ancaq səba,
Səs salar aləmlərə, ondan gərək pünhan ola.

Qəm gələndə sel kimi, möhkəm dayan sən dağ kimi,
Yıxmasın dövran səni, dünya əgər tufan ola.

Gün çıxar, zülmət keçər, qəm eyləmə, məhzun könül,
Nurlu bir istiqbala daim gərək iman ola.

Qeyr əlindən təngə gəldim, təngə gəlsin qeyr əli,
Qoyma, ey Tanrı, gəda sultanlara sultan ola!

Çox nişan olsun gərək dilbərdə hüsnündən savay,
Ta ki o hal əhlinə bir nazənin canan ola.

Gül ayağından sənin Hafiz öpər min şövq ilə,
Gözlərin neysan kimi əhvalına giryan ola.



* * *

Tərk edib, getdin məni, get-get, sənə qurban olum!
Naz edirsən, nazənin, et-et, sənə qurban olum.

Söylədin ki, öl, mənə, yox-yox, tələsmə, sevgilim,
Ta görüncə çöhrəni səbr et, sənə qurban olum.

Qəlbimi hicran odu yandırdı, gəl söndürməyə,
Bir qədəh meynabilə, ey büt, sənə qurban olum.

Oxladın kirpiklərinlə dərdməndəm, dərdmənd!
Dadıma sən, ey təbib, gəl, yet, sənə qurban olum!

Söylədin ki, qəlbinə həm yarəyəm, həm çarəyəm,
Yarə bəsdir, zülmünü tərgit, sənə qurban olum.

Xoş gedirsən, sərv qəddim, dəyməsin pis göz sənə,
Sinəm üstdə naz ilə gəl öt, sənə qurban olum.

Çatmadı Hafiz vüsalə, olmadı həmdəm sənə,
Hər qədər meylin çəkir, incit, sənə qurban olum.

* * *

Əlvida etsəm əgər qeyr evi qəmxanəyə mən,
Nəzr qıldım ki, gedəm birbaşa meyxanəyə mən.

Sağ-səlamət bu səfərdən vətənə düşsə yolum,
Əqlilə dönməliyəm artıq o viranəyə mən.

Seyrdən topladığım sirrləri açmaq üçün,
İqtida etməliyəm saz ilə peymanəyə mən.

Aşinalər qanımı içsə əgər mey yerinə,
Kafərəm üz çevirəm qeyrilə biganəyə mən.

Yarımın zülfünü zəncir eləyib boynumda,
Uymaram bir daha könlüm kimi divanəyə mən.

Gördüm əbrulərinin taqini mehrab kimi,
Səcdələr etməliyəm gözləri məstanəyə mən.

Xoş o dəm dostu vəzirlə necə Hafiz getdi,
Mey içib bir də gedəm yar ilə bütxanəyə mən.



* * *

Min dəfə cəhd elədim ta ki, mənə yar olasan,
Duyasan qəmlərimi, sən mənə qəmxar olasan.

Qoyasan nazla qədəm aşiqinin mənzilinə,
Dil verib bircə gecə sən ona dildar olasan.

Seyr edəndə çəməni sevgililər, sən də gəlib
Gül üzün, lalə ləbinlə mənə gülzar olasan.

Gecəni sübhə kimi şam olasan xəlvətdə,
Yanasan odlarıma, məhrəmi-əsrar olasan.

Qəmdən azad eləyib qullarını lütfün ilə,
Bizə bu əsrdə sən bəlkə xilaskar olasan.

Ləblərin könlümüzü qan eləyib həsrətdə,
Halımızdan ola bilməz ki, xəbərdar olasan?

Günəşi bənd edirəm ahu kimi şerimlə,
Duyasan eşqimizi dərdə giriftar olasan.

Ləblərindən iki busə mənə vəd eyləmisən,
Nə üçün verməyəsən, xalqa bədəhkar olasan?

Yaz kimi nazla gəlib gül səpəsən məclisimə,
Eyşimə, işrətimə burda səbəbkar olasan.

Hafizəm, arpa qədər şəhrdə yoxdur dəyərim,
Bəlkə sən aşiqinə təkcə xəridar olasan?

* * *

Məxmuri-cami-eşqəm, saqi, gətir şərabı,
Əl tut qədəhlə, çoxdur əl tutmağın səvabı.

Hərçənd ki, sığışmaz tərifi pərdələrdə,
Mütrüb, nəva deməkçin dilləndir o rübabi.

Bir həlqə tək əyildi qəddim sənin qapında,
Ta verməyə rəqiblər qəhrilə rədd cavabı.

Saqi, gətir şərabı, bimarınam, bilirsən,
Bir odlu busə ilə qurtar bu iztirabı.

Sığmaz mənim gözümdə yarın günəş cəmalı,
İstək könül evində salmışdır inqilabı.

Əyləşmişik yol üstdə, ümmidlə intizarıq,
Səbrim tükəndi tez gəl lələin apardı tabı.

Axir ki, hiss edirsən su qismətin deyildir,
Nahaq yerə götürmə məclisdə sən o qabı.

Göz yaşların nə istər, Hafiz, yarın ləbindən?
Gülşəndə gül açılmaz, səpsən əgər gülabı.



* * *

Kim var eşqin qulıdur, dəhrdə adəmlə pəri,
Olmaz eşq olmasa dünyadə səadət əsəri.

Cami-Cəm hər baxanda şərh eləməz əsrarı,
Vəsl axtarma, yoxundursa, bəsirət nəzəri.

Hər gecə badə içib, uyma şirin röyayə,
Quş kimi nəğmə ilə qarşıla hər gün səhəri.

Gül bilib badi-səba aşiq olubdur üzünə,
Çırpınır tellərinə, dövr eləyir dövr-bəri.

Çalış, ey xacə, bəzən eybilə ta satmayalar,
Tez alarlar qulu olsa əgər elmi, hünəri.

Gəl sənin hüsnünə mən bəxş eləyim varlığımı,
Mənfəətdir bizə hər anda nigarın zərəri.

Min bəla rədd eləyər bircə dua ilə fəqir,
Gözucu bizlərə də döndər o şux didələri.

Yatmayıb mən gecələr sübhə kimi dad elədim,
Tutdu zülmətdə əlimdən səhərin nalələri.

Vəsl şövqilə çaşıb, heyrət içində üzürəm,
Nə nəhandır gözümüzdən nə əyandır əsəri.

Bir kənar guşə tapıb sən özünə məskən elə,
Çünki eşq aləminin aləmi tutmuş xətəri.

Yandı odlarda canım, döndü külə heyrətdən,
Yarımın gəldi mənə qeyrə şam olmaq xəbəri.

Əhd qıldım daha mən, meylə keçirdim günümü,
Gəlsə də sel kimi gəlsin bu həyat dərdi-səri.

Hafizin hümməti ümmid ilə xoş müjdə verir:
Leyli gözlü gecəmiz seyr edəcəkdir qəməri.

***

Gül ləbin abi-həyatdır, qamətin sərvi-çəmən,
Surətin gündür dedim, xalinsə bir müşki-xütən.

Görmədim ömrümdə əsla qaşların tək bir hilal,
Tellərin gül dəstəsi, ləli-ləbin dürri-yəmən.

Çöhrəni seyr eyləyib əydi bənövşə boynunu,
Oldu heyran qəddinə görcək səni sərvi-səmən.

Bilmirəm gül şaxəsi, sünbül deyək ya zülfünə,
Püstədir mən bilmirəm ağzın nədir, qönçə dəhən?

Dişləyirsən ləblərin bir busə istərkən nədən?
Od salırsan canıma beylə şirin naz ilə sən.

Eşqimin söhbətləri hər yerdə bir dastan olub,
Hüsndə sən məşhur oldun, eşqdə, hümmətdə mən.

Hafizi dərdin, qəmin məhv eylədi, ey nazənin,
Bir cavab da həqq ilə, fərz eylə ki, məhşərdəsən.



***

Xoş o günlər ki, mənə tozlu küçən mənzil idi,
Etməyə sürmə gözüm torpağını mayil idi.

Sirrlər məxzəni qəlbində sənin qönçə kimi,
Məndə isə çiçəyin yarpağı tək bir dil idi.

Sevgi dərsi oxuyarkən, mənə eşq ustadı
Açdı hər məsələ ki, dərki onun müşkül idi.

Fələkin zülmü məhəbbət bağını etdi xəzan
Yoxsa cənnət kimi başdan-başa əlvan gül idi.

Könlüm əhd etmiş idi olmaya sənsiz, ey dost,
Bilmədim mən ki, onun səyi belə batil idi.

Dostları görmək üçün getmiş idim meykədəyə
Badə donmuşdu, kədər isə bu yerdə sel idi.

Söylədim sirri nədir, əqlimə bu hicranın?
O da bu sirri duyub, bilməyə naqabil idi.

Parlamışdı üzüyü burda Əbül-İshaqın,
Əfsus olsun ki, ömür gülşəni bihasil idi.

Hafiza, gördün o qəhqəhlə ötən kəkliklər
Pəncəsindən bu, qəza şahininin qafil idi?

* * *

Aləmdə işim bir dəfə səhmanə yetişməz,
Qan oldu könül dərd ilə, dərmanə yetişməz.

Əfsus! Ömür xərmənini yellər apardı,
Ancaq özümə quş kimi bir danə yetişməz.

Salmışdır ayaqdan qara dövran bizi eyvah!
Hicranda əlim sərvi-xuramanə yetişməz.

Dostun canına and ola, doydum daha candan!
Naləm, harayım bir nəfər insanə yetişməz.

Yüzlərlə tikan tutdu bu gülzarı baharda,
Nərgiz göz açıb baği-gülüstanə yetişməz.

Yəqub kor oldu, aman ey dad, Misirdən,
Bir müjdə bu qəm məskəni Kənanə yetişməz.

Cahil yetişib cəhl ilə dünyadə cəlalə,
Fəzl əhli nədən əhd ilə peymanə yetişməz.

Çatmış sümüyə indi bıçaq, neyləyim artıq,
Etsəm də fəğan ölkədə bir yanə yetişməz.

Sufi, mey ilə paltarını sən yu, təmizlə,
Pakın zərəri din ilə imanə yetişməz.

Hafiz, dayanıb səbr elə, bu eşq yolunda
Kim verməsə öz canını, cananə yetişməz.



* * *

Söylədi: tazə ayı görməyəmi çıxdın sən?
Qaşlarımdan utanıb, bircə həya etməzsən?

Çox zamandır ki, könül zülfünü məskən eləyib,
Qoyma zülmətdə ki, incitsin onu dərdü məhən.

Əqlini ətr kimi satma o hindu saçına,
Burda min nafəni bir tək telə almaz səndən.

Görmək istərsən əgər mehrü vəfa bəhrəsini,
Bir qədər səbr elə tainki gül açsın gülşən.

Badə ver, saqi, açım, şərh eləyim əsrarı;
Ulduzun seyri, ayın gərdişi, il rəmzini mən.

Tacını verdi nişan göydə hilal ibrət ilə,
Söylədi: harda edib indi Səyamək məskən?

Qapısı piri-muğanın bizə məbəd yaranıb.
Hafiza, mehrü vəfa dərsini ondan öyrən.

***

Mütribi-xoşnəva, oxu tazəbətazə, növbənöv,
Doldur o cami sən dolu, tazəbətazə növbənöv.

Harda tapanda xəlvəti sevgili, nazlı löbəti,
Qərq elə busəyə onu tazəbətazə, növbənöv.

Dur gətir o piyaləni, rədd elə ahu naləni,
Yad elə sən müdam onu tazəbətazə, növbənöv.

Bax yenə incə dilbərin ziynət olub bu gülşənə,
Sərv kimi gözəl boyu tazəbətazə, növbənöv.

Badi-səba, nigarə de qəmlər içində Hafizin
Vəsl deyə güdür yolu tazəbətazə, növbənöv.



***

Bəsindir olsa əgər bəxt xeyrxah sənə,
Nəsimi yar edə Şiraz sübhgah sənə.

Nigar mənzilini məskən et müdam özünə
Ki, sirr məxzənidir çünki xanəgah sənə.

Otur piyalə ilə, tərk elə bu dünyanı,
Gərək deyil daha bir başqa bargah sənə.

Burax nə varsa, unutma, şərab ilə yarı,
Deyil həyatda səninçin bu, iştibah sənə.

Fələk həmişə verir iqtidarı nadanə,
Sən əhli-fəzlsən, ancaq budur günah sənə.

Hücum edərsə kədər, qəm, dayan vüqar ilə
Ki, durmuş arxada piri-muğan pənah sənə.

Gedənlərin yerini seyrə dal təəssüflə,
Nələr deyirsə qoy olsun bir intibah sənə.

Baş əymə qeyrə ki, xar eyləyər cahanda səni,
Hədiyyə versə qəbul etmə padişah sənə.

Duanı, virdi kənar et ürəkdən, ey Hafiz,
Kifayət eyləyəcək naleyi-səbah sənə.

* * *

İşrət edək nigarilə, bundan gözəl nə var?
Saqi, gətir şərabı, nədir beylə intizar?

Cənnət, behişt, ab-həyat! Hər nə var budur!
Əfsanədir nə varsa, budur harda hər nə var.

Hər yanda əl verərsə, sən əl çəkmə eyşdən,
Kimdir görən cahandakı əsrarı aşikar?

Ömrün devamı bir tük ilə bağlıdır, ayıl!
Qəm çəkmə, qırmasın onu hiddətlə ruzigar.

Ey müddəi, bu sirri soruş məst rinddən,
Dəva nədir ki, anlamaz əsrarı pərdədar.

Məsturü məst hər ikisi yardır bizə,
Hansılə yar olaq, nədir ey yar, son qərar?

Zahidlər abi-kövsəri, Hafiz şərab içir,
Nisyəylə nəqd bir deyil, əlbəttə, fərqi var.



* * *

Aşiqəm yarə, işim yox küfr ilə iymanilə,
Sərxoşam, xoş olmaram vəsl ilə ya hicranilə.

Gül ləbindən vermədi bir busə yarım aşiqə,
Verməyibdir can mənə, cansız nedim cananilə!

Soydu bu dövran bizi yox qorxumuz heç kimsədən!
Müflüsük, müflüsləri qorxutmayın divan ilə!

Qibləmiz, mehrabımız yarın hilal əbrusudur,
Bir də biz əhd etmərik əflak ilə, dövran ilə.

Hər iki dünyadə mən dildar ilə yar olmuşam,
Atmışam cənnətləri, huriləri qılman ilə.

Kim edibdir eşqilə cananına canın fəda,
Dərdinə etməz dəva dünyadə heç dərmanilə.

Surətin lazım deyil, batində sən mərdanə ol,
Mərd olan fəxr eyləməz zahirdəki ünvanilə.

Aşiqəm məstanəyəm, Hafiz, bunu təkrar elə,
Aşiqəm yarə, işim yox küfr ilə imanilə!

* * *

Rəməzan getdi, yenə könlümüzə can gəldi,
Eyş meyxanəmizin şəninə şayan gəldi.

Zahidin dövrü keçib, ötdü kədər əyyamı!
Rindlər məclisinə bir yeni dövran gəldi.

Əzəlindən hərədə bir cürə adət yaranıb,
Badə içmək nə üçün bizlərə nöqsan gəldi!

Badədən dəyməyib heç kimsəyə bir qətrə ziyan,
Zöhddən xəlqə bəla, bəlkə, bir ümman gəldi.

Nə nifaq ilə işim var, nə riya ilə mənim,
Narəva işlərə nifrət bizə asan gəldi.

Birinə pislik edib aşmırıq öz həddimizi,
Kim ki pislik elədi, axırı peşman gəldi.

Mey üzüm şirəsidir, bir adamın qanı deyil,
Nə üçün içməyimiz sizlərə qan-qan gəldi?!

Heç də bu eyb deyil, olsa da heç eyb deyil,
Eybsiz yer üzünə hansı bir insan gəldi.

Hafizi eylədi pərgar tək avarə xalın,
Qəlbi bir nüqtədə öz eşqinə qurban gəldi.



* * *

Səba, de lütf ilə o gül yanaqlı ceyranə
Ki, sən bizi bu cürə salmısan biyabanə.

Şəkər satan, nə olar, ömrü çox uzun olsun,
Bu tutini çağıraydı şirin bir ehsanə.

Soruşmadı necədir, halı bülbülün əsla,
Çadır vuranda o gül nazilə gülüstanə.

Ədəblə, xülqlə sən arifi şikar eylə,
Qızıl quşu tuta bilməz kəmənd ilə danə.

Keçib gedənləri də bir dəqiqə yadına sal,
Həbib ilə oturub qaldıranda peymanə.

Səbəb nədir ki, bizə lütf edib yaxın gəlməz,
Gedin deyin qara göz, nazlı, duzlu cananə.

Daha nə şərh eləyim eybini ki, xalı kimi,
Vəfa nişanəsi yoxdur üzündə bir danə.

Gətirdi Zöhrə Məsihanı rəqsə göylərdə
Bu şeri vəcd ilə Hafiz deyəndə məstanə.

* * *

Min ox da yağsa kuyunda hər gah,
Baş çəkmərəm mən, "əlhükmü lillah".

Mən rindi-aşiq, guya ki, tövbə,
Əstəğfirullah-əstəğfirullah!

Təqvanı biz də az-çox bilirdik,
Amma nə etmək, bəxt oldu gümrah.

Kimdir bu yerdə şeyx ilə zahid?
Ya cami-badə, ya qissə kutah!

Lütfün bizimçün bir sayə salmaz,
Ayinəüzlü, ah eylərik, ah.

Səbr etmək? Əsla! Ömr oldu fani,
Ey dərdli şerim, "hətta minəlqah".

Vəsl istəyirsən, aşiq, mətin ol!
Can ver, sən etmə eyvay, eyvah.

Hafiz, yəqin ki, dərd çəkməz idin,
İşdən əzəldə olsaydın agah.



* * *

Cənnətə getmək üçün kimdir çıxan meyxanədən,
Kim nəyi tutmaq dilər, ta əl çəkə peymanədən?

Məst idi piri-muğan bir xoş müəmma söylədi:
Xəlq olub saqi nədən, mina nədən, səhba nədən?

Badə iç, qəm eyləmə, dünya keçər, qalmaz belə,
Sən nəsihət dinləmə zahid kimi biganədən.

Bəsdir axır, söyləmə, ömrüm keçir, dövran dönür,
Dəhrdə kam almadıq onsuz da ki biz heç nədən.

Bəndə düşmə, ey könül, yüksəl göyə şahin kimi,
Baxma, keç nakəslərin bəxş etdiyi hər danədən.

Öz gücün, öz zəhmətinlə külbəni abad elə,
Mərhəmət lazım deyil heç qəsrdən, kaşanədən.

Könlünü mən Hafizin aldım qəzəllə, çəng ilə,
Ta görək dövran nə istər beylə bir məstanədən.

***

Cananəsiz nə eylər bir kimsə bu cahanı?
Canandan ötrü bəslər könlüm cahanda canı.

Hər kimsədən soruşdum, ondan soraq verən yox,
Gün tək gözəl camalın yoxdur izi, nişanı.

Ariflərin gözündə hər qətrə bir dənizdir,
Şərh olmayıb bu sirrin, əfsus ki, bir bəyanı.

Ey sariban, amandır, yollarda diqqət eylə,
Ta udmasın biyaban qəflətdə karivanı.

Qəlbində nəğmələr var, dinlə kamanı yaxşı
Aşiqlərin toxunmaz heç bir kəsə ziyanı.

Əfsus, dərk edən yox, yaxşı məsəl deyiblər:
Dost qaytarar olub sədd sel tək gələn bəlanı.

Əğyarə sirr vermə, yansan da qəm odunda,
Sən şəm tək özünçün ağla özün nihani.

Qarun xəzinə yığdı, torpaqda itdi-batdı,
Söylə çəməndə güllər yad eyləsin xəzanı.

Hər kəs "mənəm" deyirsə, hətmən ki beyni boşdur,
İstərsən imtahan et, yoxdur bunun yalanı.

Məstanəlik işində ustad olub o darğa,
Getməz ona bu işdə heç bir kəsin gümanı.

Heç bir qulun əzizim, sultanı yox sənin tək.
Hafiz kimi də qul yox axtarsalar cahanı.



***

Aləmin qaməti, ey şəh, sənə çovkan olsun!
Çərx çovkanına top, yer üzü meydan olsun.

Tutmusan hər tərəfi hüsni-kəmalilə tamam,
Xilqətin öz-özünə yarü nigəhban olsun.

Zəfərin zülfü gərək ziynət ola bayrağına,
Fəthü nüsrət belə bir şövkətə heyran olsun.

Şənini lövhinə nəqş etdi: "Ütarid göydə,
Gözləyir indi fələk bir yeni fərman olsun.

Vurulub qəddinə Tuba o qədər şövkət ilə,
Bağı-Firdovs sənin qəsrinə eyvan olsun.

Canlı-cansız yaranan hər nə ki, var dünyadə,
Hamı bir yerdə, gülüm, canına qurban olsun.

Xəstə Hafiz səni ixlas ilə tərif eləyir,
Ta şəfa verməyə lütfün ona dərman olsun.

* * *

Məskən olmuş könül məhəbbətinə,
Gözlərim güzgüdür vecahətinə.

Gərçi baş əymərəm səmavatə,
Bir qulam hər zamanda izzətinə.

Yar bizim, cənnət isə əğyarın,
Pay düşür hər kəsin həmiyyətinə.

Getdi Məcnun, mənəm bu gün aşiq,
Nəzər et dövrümün səadətinə.

Mən kiməm? Heç! o yerdə badi-səba
Pərdədardır hərim-hörmətinə.

Eşq, şadlıq nə varsa dünyadə,
Eylərəm sərf yar xidmətinə.

Mən və könlüm fəda ola, nə olar?
Qurban olsun nigar səhhətinə.

Ona baxmazsa, qoy gözüm çıxsın,
Xasdır çünki seyr-xəlvətinə.

Tazə güllər açıldı gülşəndə,
Dil açıb hüsnünün hekayətinə.

Demə Hafiz fəqirdir, ey dost!
Qəlbi bir xəznədir məhəbbətinə.



* * *

Yardəndir dəhrdə həm dərd, həm dərmanımız,
Qəlbimiz olmuş fəda dildarə həm də canımız.

Söyləyirlər hüsndən yüksək olan bir hüsn var,
Hüsndə ülvi gəlib, hər hüsndən cananımız.

Gül üzündən zərrədir dünya və mafiyha onun,
Surətində əks olub izah üçün dastanımız.

Pərdədə saxlarsan, ancaq vazeh olmuş aləmə,
Söylənir dillərdə bir-bir gizlimiz, pünhanımız.

Hardadır can qəsdinə ləşkər çəkən kirpiklərin?
Sınmış o cəlladilə bilməm neçin peymanımız?

Nərgizi-məstinlə zülfün bənd edib aşiqləri,
Eşq üçün cari olub öz meylimizlə qanımız.

Mey gətir, qazi nədir, aşiqlər ondan qorxarlar!
Lütf edibdir məstlərə meyxanədə sultanımız.

Aləmin əfalına yox könlümüzdə etibar,
Bəlkə də məhv eylədi birdən bizi dövranımız.

Vəslimiz hicran olub, qəm eyləmə, qalmaz belə,
Vəsl ilə təbdil olar axırda bu hicranımız.

Asəfi-dövran bilir, Hafiz müdam məstanədir,
Möhtəsib, ondan soruş sən, hardadır ünvanımız.

* * *

Yar olar biz fikr edirdik yarımız,
Səhv imiş, əfsus ki, bu əfkarımız.

Aşinalıq toxmunu əkdik hamı,
Gözlərik ta gül aça gülzarımız.

Çox danışmaq eybdir dərvişlərə,
Az deyil şərh olmamış əsrarımız.

Gözlərin işvəylə daim zülm edib,
Sanmışıq səhvən onu qəmxarımız.

Hər sitəm qıldın rəva, səbr eylədik,
Ta ki şad olsun bizim dildarımız.

Hüsnünün gülzarına hayil olub,
Bicəhət qaim deyil divarımız.

Özgəyə verdin könül, atdın bizi,
Vəslilə xoşbəxt olub əğyarımız.

Söyləyir ki, verməyəydin könlünü,
Hafiza, yoxdu sənə israrımız?



* * *

Məhəbbətlə nəzər salsa mənə ayüzlü gül canan,
Vəfa nurilə dünyadə çətinliklər olar asan.

Heyif layiq deyil, neylim, dəyər yoxdur mətaimdə,
Çəkib sevdayi-eşqində edərdim canımı qurban.

Qiyamətlər qiyam eylər, tutar dünyanı ğovğalar,
Kənar etsə əgər canan niqabı gül camalından.

Xəbər tutsaydı dərdimdən mərizi-eşq Loğmanı,
Yəqin mehrilə eylərdi pərişan könlümə dərman.

Olarsa başqa aləmdir, müyəssər olmayır vəsli,
Bir anlıq fani dünyadə aman vermir bizə hicran.

Deməzdi kimsə Hafiz tək şirin bir şeir aləmdə,
Əgər bir busə versəydi nigarı ləli-nabından.

* * *

Nazənin, pərdəni sən atdın üzündən, bu nədir?
Məstsən yox xəbərin yoxsa özündən, bu nədir?

Sən gözəllər şahısan, mənsə fəqir aşiqinəm,
Saxla öz aşiqini, salma gözündən, bu nədir?

Zülfünü badi-səba əldə oyuncaq eləmiş,
Kam alır qeyrilə biganə sözündən, bu nədir?

Tellərin bənd elədi könlümü əvvəldə, fəqət
Ayağın öpməyə qoymur qərəzindən, bu nədir?

Ləblərin rəmz deyir, incə belin işvə satır,
Bəlkə bir çarə ola dərdə nazından, bu nədir?

Bəzəyib külli-cahanı üzünün nuru sənin,
Hərə bir zövq alacaq ay bənizindən, bu nədir?

Könlüm, əğyarı kənar eylə ki, dildar gəlir,
Hafizin bir xəbər alsın mərəzindən, bu nədir?



* * *

Ey səba, ətr gətir yar bağından, mənə ver,
Ölmüşəm qəmlər əlində, yenidən can mənə ver.

Qapısından gülümün bir belə torpaq gətirib,
Yarəli sinəm üçün mehrilə dərman mənə ver.

Ürəyim cəngə çıxıb, köksümə od vurmadadır,
Yox silahım, qaşını rəhm elə bir an mənə ver.

Ver meyə nifrət edən şeyx də baxsın dadına,
Etiraz etsə əgər, olma peşiman, mənə ver.

Qoyma qalsın sabaha, saqi, bu gün işrət edək,
Ya aman naməsi yazsın acı dövran, mənə ver.

Qanə döndü ürəyi, söylədi Hafiz qəmlə:
Ey səba, ətr gətir yar bağından, mənə ver.

***

Zəmisində fələkin sandım oraqdır təzə ay!
Mən nə əkdim nə biçəm, söylədim ey vay haray.

Dedim ey bəxt, günəş çıxdı, ayıl aç, gözünü,
Naümid olma, dedi, itməyəcək həqq ilə say.

Arxalanma bu cahan mülkünə ki, əyyardır,
Qalmayıb Xosrova, Kavusa cəlal ilə saray.

Çıx Məsiha kimi əflakə təcəlla ilə sən,
Üzünün nurunu sən göydə günə, aya də yay!

Çəkməsin, qoy özünü ayilə Pərvin o qədər,
Eşq mülkündə deyil hər biri bir aşiqə pay.

Yaxşı söz saxla qulaqda, əbədi gövhərdir,
Sırqaya baxma, onu az o başın ziynəti say.

Hüsn bürcündə o xalın nə qiymət eylər!
Qəmərin hüsnünü etmiş o qara rənglə zay!

Biri əkməzsə könüllərdə məhəbbət toxumu,
Hasil olmaz ona heç kimsədən aləmdə haray.

Sən cahan dairəsində döyülən dəf kimi ol,
Nə yerindən çıx, iki zərbə dəyəndə, nə də cay!

Od vurur rəngü riya gör necə din xərməninə,
Hafiz, at xirqəni sən, olma o zahidlərə tay.



***

Xoşdur o gül üzünlə ömrün bu taləzarı,
Gəl, gəl ki, soldu sənsiz dünyamızın baharı.

Yaş axsa gözlərimdən neysan kimi, rəvadır,
Sənsiz fəraq əlində məhv oldu ruzigarı.

Mən ölmüşəm dirikən, siz etməyin təəccüb,
Çünki ömür deyildir eylə gözəldən ayrı.

Fikr eyləməz ölümdən dünyadə hər kəsin ki
Vardır, gülüm, sənin tək məstanə bir nigarı!

Almış nişan bəlalər aləmdə hər tərəfdən,
Qaçmış həyat çölündən məhzun ömür şikarı.

Fürsət varikən əldə seyr et o gül cəmalı,
Birdən alar əlindən dövran bu ixtiyarı.

Böylə gözəl səhərdə məstanə yatmaq olmaz,
Yatma, ayıl ki, yoxdur dünyanın etibarı.

Ömrüm kimi keçirdi, səbr etmədi bir anlıq,
Fəryad edib çağırdım o gözləri xumarı.

Hafiz, gözəl şeir de dünya durunca dursun,
Ta ki budur, desinlər aləmdə yadigarı.

* * *

Bülbül gül üstə pəhləvi ahəngilə səhər
Söylərdi xoş məqamilə mənalı nəğmələr,

Yəni ki, gəl, gül eylədi Musanın atəşi,
Gəl nüktə dinlə qəlbini qoy tutmasın kədər.

Ta xacə məst olub içə gülrəng badəni
Quşlar açıb budaqda təranəylə balu pər.

Cəmşid cam hekayətini saxlayıb fəqət,
Var-dövlətə cahanda uyub yatma bixəbər.

Fərşim mənim həsirdisə də etdiyim bu eyş,
Mümkün deyil o şahə, saray zərsə də əgər.

Mən dərvişəm, başımdakı bu köhnə yun papaq
Şahlar qoyan bəzəkli qızıl tacə min dəyər.

Yar İsəvi nəfəslə bizi öldürüb əcəb!
Bir bəxtə bax, bu taleyə sən eylə bir nəzər?!

İşvəylə gözlərin yaxıb aləmdə evləri,
Məstanəsən o nərgizinə dəyməsin nəzər.

Bir gün öz oğluna qoca dehqan gözəl dedi:
Hər kim nə əkdisə onu ancaq dərib biçər.

Seyr etdi halını, ona mat qaldı Mövləvi
Saqi nə ilə Hafizi məst eylədi məgər?!



* * *

Qəlb Cəm camını bizdən diləyir dünyadə,
İstəyir özgədən üzdə, özüdür mənadə.

Elə gövhər ki, bütün aləmə sığmaz şəfəqi,
Qərq olanlardan onu etdi tələb dəryadə.

İstədim piri-muğan müşkülünü həll eləsin,
Hər müəmmanı ki, açmaqda olub amadə.

Uçurub könlünü əflakə, düşüb məstanə,
Həqlə söhbət eləyir hörmət ilə röyadə.

Şad idi, xürrəm idi, əldə dolu peymanə,
Sirləri seyrə dalırdı o zərif minadə.

Söylədim ki, sənə bu cami nə vaxt verdi həkim?
O zaman ki, dedi, yoxdu fələki-əla də.

O qədər şöbədələr ki ağıl eylərdi müdam,
Yox idi sehr hələ onda yədi-beyzadə.

Nə üçün, söylədi, dildar çəkilmiş darə?
Çünki əsrarı açıb faş eləyibdir yadə.

Feyzə gəlsə əgər əltafı o Ruhül-qüdüsün,
Hamıya mümkün olar hər nə olub İsadə.

Heç bilirsən ki, nədir zülfü, dedim, cananın?
Hafizin fikri, qalıb, söylədi o, Yəldadə.

* * *

Sənin o qaşlarını kim əyib kəman etdi,
Mənim alıb canımı, zarü natəvan etdi?

Şərab ilə gül açıb odlu ləblərin, ey yar,
Aman ki, bağrımızı qəmzə ilə qan etdi.

Qara gözün ki, bir az naz ilə xumar oldu,
Görən haray çəkib, naləvü fəğan etdi.

Səba dedi səmənə: bənzəyir üzün yarə,
Utandı, öz-özünü pərdədə nihan etdi.

Ləbin xəyalı ilə qönçəyə nəzər saldım,
Baxıb bu halətimə aşiqi güman etdi.

Bənövşə tellərini görmək istəyən yerdə,
Səba gəlib saçının mədhini bəyan etdi.

Bu gün ki mey içirəm, xirqəpuş dərvişəm,
Əzəldə bəxt mənə bunları əyan etdi.

İki cahanda bizim, eşqdir fəqət payımız,
Məhəbbəti deməyin bəxş bu zaman etdi.

Səbəbsiz olmamışam mütrübə, meyə mayil,
Ətirli gördü könül zülfünü, məkan etdi.

Qəmim nədir ki, dəxi xacəyə ğulam oldum,
Hüzuruna məni dövran onun rəvan etdi.

Yəqin düyünlərini həll edib açar Hafiz,
Ki pirimiz ona meynabı ərməğan etdi.



* * *

Söylə, meyxanə kimi ülvi gözəl guşə hanı?
Qoca vaxtımda mənimçün də ola imkanı.

Arizu eyləyirəm, indi nə gizlin səndən,
Badəni, meykədəni, bir də gözəl cananı.

Məskənim deyri-muğandır, oturam bütlər ilə,
Ta ki məstanə olam gözlərinin heyranı.

Yoxdur aləmdə mənim tək, desə hər kim, aşiq
Məhz cahil sözüdür, dinləməyin nadanı.

Ey sənəm, xatirimiz təkcə sənə məskən olub,
Qoymarıq eşq evinə ayrıca bir mehmanı.

Baədəb ol ki, bizim pir kimi dünyadə
Hər yetən söyləyə bilməz belə bir mənanı.

Hər günün bir sabahı, hər sabahın axşamı var.
Ver bu gün Hafizinin dərdlərinə dərmanı.

* * *

Elə bir badə gətir püxtə edə hər xamı,
Rəməzan olsa da, sən baxma, dolandır camı.

Keçdi günlər, nə edim, olmadı mümkün yapışam
Biləyindən gülümün, ötdü bahar əyyamı.

Ramazan gəldi, qonaqdır, nə deyim, xoş gəldi,
Müjdə ver sən ki, gedir, var sözünün ənamı.

Gctməyin suməəyə, quşları bənd etmək üçün,
Tor edib zahid o məskəndə bütün ovhamı.

Nə deyim zahidi-bədkarə, bilir hər kəs ki,
Hər işıq gündüzün ardınca olur bir şamı.

Yarımız çıxsa çəmən seyrinə, ey badi-səba,
Sən yetir bizdən ona gizlicə bir peyğamı.

Hanı bir eylə pəri ki, mey içə məstlər ilə?
Sonsiz, ey nazlı gözəl, kimdən alaq biz kamı?

Hafiza, vermədi sultan sənə dövründə aman,
Müşkülə düşdü işin, dadə çağır ilhamı.



* * *

Ola bizlərə müyəssər mey ilə gül üzlü canan,
Nə gərək o dərd-sərlə şah ola cahanə insan?!

Həsəd eylərəm ki, yarə gözüm eyləyər nəzarə,
Gərək eyləmək nəzərdən belə bir nigarı pünhan.

Ürəyim gedib əlimdən, görəsən hayanda qaldı?
Sona çatdı ömr qəmlə, xəbər almadıq biz ondan.

Üzünü doyunca görmək mənə olmadı müyəssər,
Onu görməyə bizimçün nə olar olarsa imkan?

Neçə qurban etsin Hafiz tükünün birinə min can,
Dayan, ey səba ki, zülfü yarın olmasın pərişan.

***

Səhər-səhər gül açarkən şərab lalə kimi,
Yanar nigarın üzü mey dolu piyalə kimi.

Səba darar telini sünbülün məhəbbətilə,
Yayar gözəl iyini ta bizim məhalə kimi.

Fəraq odu iki camla sönən deyil, saqi,
Gərək ki, mey axa meyxanədə şəlalə kimi.

Əl açma sən fələkə, umma yaxşılıq ondan,
Ötüb başından onun, keç sən odlu nalə kimi.

Ümidinin gəmisi möhkəm olsa sən qorxma,
Daşarsa qəm seli yerdən göyə – hilalə kimi.

Sürünmə kölgə kimi məqsədin ayağında,
Gələr özü qapına bir zaman həvalə kimi.

Cənubdan əssə əgər Hafizin məzarına yel,
İnan ki, məst edəcək aləmi şimalə kimi.



***

Durarsa qəsdimə hər gah mənim bütün dövran,
Nigar yarım ola, qorxmaram mən onlardan.

Məni ümid yaşadır, vəslinə çatam bir gün,
Yıxardı yoxsa fəlakətlə sel kimi hicran.

Səbadan ətrini aldım sənin bu gülşəndə,
Qəmindən oldu könül bir çiçək kimi al qan.

Gedərmi heç yuxuya gözlərim xəyalınla?
Dözərmi dərdə könül sənsiz, ey gözəl canan?

Vurarsa yarə gözün, qeyridən dəva almam
Ki, yar dərdi özü dərdlərə olur dərman.

Sənin gözəl üzünü görmək istəmir zahid,
Bu hüsnü dərk edə bilməz o qəlbi kor nadan.

Kəsilsə başım ayağında dilbərin, xoşdur,
Əzəldə çünki yarandım yolunda mən qurban.

Yəqin ki, xəlq gözündə əziz olar Hafiz,
Əgər nigarinə təzim üçün tapa imkan.

* * *

Hər qədər meykədəni görməyə imkan olacaq,
Canımız pirimizin canına qurban olacaq.

Sırğası piri-muğanın qulağımdan asılıb,
Bir nişandır ona qul olmağa, hər an olacaq.

Ehtiyat ilə dolan qəbrimin üstündə mənim,
Çünki hal əhli üçün məbədi-dövran olacaq.

Ayağın hər yerə dəymişsə sənin dünyadə,
Daim aşiqlər üçün rövzeyi-rizvan olacaq.

Gözlərindən sənin, ey əqli sönük, kor zahid,
Xilqətin sirri müdam dəhrdə pünhan olacaq.

Məst türküm yenə də məst çıxıb meykədədən,
Görsə aşiqlər onu orta da min qan olacaq.

Məstliyi eyb eləmə, xacə, bizi dünyadən
Aparan kim nə bilir ki, necə tufan olacaq.

Qəlbimiz zülfünün ardınca məzardan da baxıb,
Həşrədək, nazlı mələk, halı pərişan olacaq.

Bəxti yar olmadı Hafizlə fəna dünyadə,
Bəxtəvər yarı gedib özgəyə canan olacaq.



* * *

Əl çəkdi getdi hicran, gül üzlü yar gəldi,
Fal açmaq istəyirdim, gördüm nigar gəldi

Hərçənd at çapırdı, tufan mənəm deyirdi,
Açdı gözəl çiçəklər, nazlı bahar gəldi.

Bundan belə cahanı könlüm tutar qəmər tək,
Artıq günəş üzündən bu iqtidar gəldi.

Dildarımız göründü, getdi bütün kədər, qəm,
Çünki bizim diyarə o laləzar gəldi.

Dərd çəkməsin, ilahi, saqi ki, biz fəqiri
Yad etməyə mey ilə gözlər xumar gəldi.

Lalə qoyub qızıl tac, toy paltarı geyindi,
Çəkdik əgərçi xeyli biz intizar, gəldi.

Düşmən qəvi, günüm bəd, əsla inanmıram ki
Göz açmağa bizimçün bir ixtiyar gəldi.

Keçdi gecə, işıq saç, sən ey ümid sabahı,
Çıxdı qara buluddan, gün aşikar gəldi.

Zülfündən ayrı könlüm qəmlərdə çırpınırdı,
Vəslinlə, ey nigarım, artıq qərar gəldi.

Dövran deyirdi, Hafiz kimdir, nədir bu yerdə?
Getdi o köhnə sözlər, tazə şüar gəldi.

* * *

Xəstə çox şey dilər, ancaq ona qismət olmaz,
Xəstəyə zülm nə lazım, bu mürüvvət olmaz.

Biz cəfa görməmişik, sən də rəva görmə daha,
İnsaf eylə, kişidə yarə xəyanət olmaz.

Mərhəmət eyləməsə şəmə sənin məst gözün,
Eşqə nur saçmaq üçün, onda məhəbbət olmaz

Mən özümdən ki, bu cür bixəbərəm aləmdə,
Bir mədəd eyləməyə kimsəyə fürsət olmaz.

Hər kəsin güzgüsü saf olmasa pasdan-ləkədən,
Gözünə əks onun həqq ilə hikmət olmaz.

Kordur aləmdə o göz ağlamasa sevgi üçün,
Yanmasa qəmlə ürək onda həqiqət olmaz.

Paklıq olmazsa nə Məkkə, nə də bütxanə gərək,
Xeyir olmaz elə bir evdə ki, ismət olmaz.

Bülbülün cəh-cəhi gəlməzsə, açılmaz könlün,
Qarğa, quzğun uçuşan bağda təravət olmaz.

Pirimizdən diləərəm yar ola bu könlümüzə,
Ona bağlanmasa heç qəlbdə həmiyyət olmaz.

Hafiza, elm-ədəblə özünə ziynət ver
Ki, ədəb olmasa, o yar ilə söhbət olmaz.



* * *

Ey məh kimi cəmalı baharı gözəlliyin,
Ey xətti, xalı lütfü mədarı gözəlliyin.

Pünhan xumar gözündə sənin cümlə fitnələr
Tapmış qərar saçında qərarı gözəlliyin.

Ay görməyib üzün kimi bu hüsnün aləmi,
Şümşad boyun cəlalı, vüqarı gözəlliyin.

Dilbərlik əsrinə bəzək olmuş məlahətin,
Ziynət tapıb ləbinlə diyarı gözəlliyin.

Yox bir könül ki, zülfün ilə xalını görüb,
Dünyadə olmasın o, şikarı gözəlliyin.

Bir dayə tək böyütmək üçün bu cahan səni,
Hər nə varıydı oldu nisarı gözəlliyin.

Daim bənövşə abi-həyat içdi, qaldı tər,
Oldu ləbin o çeşmə kənarı gözəlliyin.

Hafiz sənə cahanda bir oxşar tapammayıb,
Yox səndən ayrı çünki nigarı gözəlliyin.

* * *

Nəfəsi badi-səbanın yenə əfşan olacaq,
Köhnə aləm dönəcək, bir yeni dövran olacaq.

Ərğəvan cami-əqiqi verəcək yasəmənə,
Nərgizin gözləri zənbəqlərə heyran olacaq.

Gül qonaqdır, ona hörmət eləyin gülşəndə,
Əsəcək badi-xəzan, halı pərişan olacaq.

Qoyma şabanda əlindən yerə camı, bu günəş
Ramazan ayı bütün kölgədə pünhan olacaq.

Bu qədər zülm çəkir hicrin əlindən bülbül,
Gülü gördükdə işi ah ilə əfğan olacaq.

Əldə fürsət var ikən eyşini qoyma sabaha,
Kim bilir ki, belə gün görməyə imkan olacaq?

Mütrüba, sazı götür, məclisi nəğmənlə şən et
Ki, həyat mənzilinin axiri viran olacaq.

Tərk edib məclisi mən getsəm əgər meykədəyə,
Vaiza, eyb eləmə, yoxsa könül qan olacaq.

Səni seyr etmək üçün qoydu bu dünyayə qədəm,
Lütf elə Hafizə, beş gün sənə mehman olacaq.



* * *

**Rindlərin məclisinə eylə nəzər bundan gözəl,**
**Durma, sal meykədəyə bir də güzər, bundan gözəl.**

**Ləblərin lütf eləyir aşiqinə, yox sözümüz,**
**Mümkün olsa gözəl et, hər nə qədər bundan gözəl.**

**Beylə ki, fikri düyün açdı bütün işlərdən,**
**Eyləsin işlərimə yaxşı əsər bundan gözəl.**

**Neyləyim, verməyim öz könlümü ol gül bədənə?**
**Bir gözəl varsa nişan ver sən əgər bundan gözəl.**

**Söyləyirlər ki, qəm olmuş fəqət eşqin hünəri!**
**Deyirəm harda olub başqa hünər bundan gözəl?**

**Qələmindən saçılır şəhdü şəkər Hafizinin,**
**Hanı bu bağda şirin, dadlı səmər bundan gözəl?**

* * *

Yarəb, kömək et ki, o gözəl yar səlamət
Dönsün geri, versin bizə vəslilə səadət.

Getdi səfərə, qoy yolunun tozları gəlsin,
Etsin gözüm üstündə mənim nazla iqamət.

Fəryad ki, bənd etdi məni altı tərəfdən,
Zülf ilə xətü xal, yanaq çöhrəvü qamət.

Ey dost, bu gün ta səninəm, mərhəmət eylə,
Sonra nəyə lazım edəsən ahilə həsrət?

Təqrir bəyan eşqdə cayiz deyil, ey yar,
Sözsüz sənə biz bəsləyirik qəlbdə məhəbbət.

Dərviş, nədir nalə gözəllər sitəmindən?
Əvvəldən ediblər belə zülm etməyə adət.

Öz xirqənə od vur ki, qılınc qaş ilə saqi,
Mehrabi xərab etdi, dedi: bəsdir ibadət.

Mən incimərəm hər nə qədər cövr edə dildar,
Lütf etməsə də zülmü qılıbdır o, kəramət.

Hafiz necə zülfün sözünü müxtəsər etsin?
Dillərdədir o ta ki qiyam etsə qiyamət.



* * *

Saqimiz Xizr, mey də abi-həyat,
Neçə mən tövbə eyləyim, heyhat!

Acı badə şirin dodaqlardan,
Heçə dəyməz yanında qəndü nabat.

Lütfi-İsa kimi əsəndə nəsim,
Ölüyə bəxş edir o dəmdə həyat.

Odlu bir su ki, yəni köhnə şərab,
Mənə qəmdən verib cahanda nicat.

Ruzumuz eşq əlilə dünyadə,
Badeyi-nab olub əzəldə bərat.

Ruhu şəndir həmişə hər rindin,
Müğlərin kuçəsində etsə vəfat.

Ömrünün hasili bu aləmdə,
Hafiza, badə ilə tapdı səbat.

* * *

Açmaram könlümü canana, həvəsdən,
Dinlərəm bir belə əfsanə, həvəsdən.

Gün kimi sirrimiz aşkar olunubdur,
İstərəm bilməyə biganə həvəsdən.

Böylə bir xoş gecəni sübh açılınca,
Yatmışam mən necə məstanə həvəsdən.

Əyləşib böylə qaranlıqlar içində
Saçmışam dəftərə dürdanə həvəsdən.

Getmə, ey badi-səba, gəl qonaq ol, sən,
Bax səhər qönçeyi-xəndanə həvəsdən.

Yarımın yollarını hey öpürəm mən,
Olmuşam gör necə divanə həvəsdən.

Müddəilər ola ta kor, yazıram mən,
Şeri Hafiz kimi rindanə, həvəsdən.



* * *

Sən ki, daim özünlə məğrursan,
Eşqə biganəsənsə, məzursan?

Eşq divanəsindən əl çək, get!
Çünki sən əqlin ilə məşhursan.

Yoxdur eşqin həvası qəlbində,
Kibr ilə bağlıdır gözün, korsan.

Saralıbdır üzün, özün aciz,
Xəstəsən sən, bu halə məcbursan.

Arı tərk et, utanma sən, Hafiz!
Bir qədəh badə iç ki, məxmursan.

* * *

Qəmdən xəbərdar etdim təbibi,
Qoydu əlacsız miskin qəribi.

Sən, ey tikanla həmdəm olan gül,
Yaddan çıxarma bu əndəlibi.

Dərdi nigarə izhar qıldıq,
Biganə saymaq olmaz həbibi.

Dərdli sözilə, solğun üzilə
Bu aşiqin də çöldür nəsibi.

Yarəb, ayırma dildarı məndən,
Yar etmə yarə hər nanəcibi.

Mehrü məhəbbət üşşaqə xoşdur,
Rədd et, ilahi, burdan rəqibi.

Qovma qapından, ey yar, amandır,
Hörmət gözünlə əfv eylə eybi.

Hafiz, yəqin ki rüsva deyildin,
Sən dinləsəydin hərgah ədibi.



* * *

Nişan yoxdur bu dünyadə vəfadən,
Vəfa umma daha heç aşinadən.

Xəsislər varlanıblar hiylə ilə,
Aman istər hünər əhli gədadən.

Tutubdur aləmi dərd ilə möhnət,
Bu gün fəzl əhli qan ağlar bəladən.

Dönür cahillərin rəyilə dövran,
Doyublar dünyada zövqü səfadən.

Əgər şair gözəl bir şeir yazsa,
Uzaq olsa sözü məkrü riyadən.

Sənai olsa da qiymət verilməz,
Yağar böhtan ona əhli-cəfadən.

Dünən əqlim mənə bir söz deyibdir:
Çalış, səbr eylə, keç sən masəvadən.

Başın daşdan-daşa dəyməzsə, Hafiz,
Ayılmazsan həyatda hər sədadən.

* * *

Eylərəm firqət əlindən gecə-gündüz fəryad,
Yetməz ahim sənə, bir kimsə də etməz imdad.

Nə edim, eyləməyim naləvü fəryadü fəğan?
Ağlayıb dad edəcək, olmasa könlüm azad.

Dərd-qəm, qüssə, kədər bağrımı qan etmədədir,
Səndən ayrı nə ilə olsun, əzizim, dilşad?

Tərk edib ta ki məni özgəyə dildar oldun,
Eylərəm ey gözəlim, vəslin üçün dad-bidad.

Səbrimin səddini göz yaşları viran elədi,
Eşqimin mənzili bu seyl ilə oldu bərbad.

Qəmdə qərq olsa da Hafiz, səni yad eyləyəcək,
Sındırıb əhdini, oldun ona düşmən kimi yad.



* * *

Yandım fəraq odunda, az eylə gəl cəfanı!
Yarəb, mənim canımdan rədd eylə bu bəlanı.

Göy mərkəbində ərşin ay çıxdı cilvə ilə,
Sür sən də Rəxşi durma, ay keçmədən səmanı.

Mey ilə əqli, dini məhv et, çıxart başından,
Əyri qoyub külahı, cır, at daha əbanı.

Sünbül kimi çəməndə hər vaxt bahar gələndə,
Aç zülfünü, ətirlə mədhuş elə səbanı.

Ey məstlərin əzizi, öldüm mən intizarda,
Çal çəngi, meylə məst et, yainki al bu canı.

Dövran nigar üzündə xəttilə kölgə saldı,
Hifz eylə pis yazından, yarəb, o məhliqanı.

Hafiz, payın qəm olmuş məhvəşlərin əlindən,
Ya razı ol, danışma, ya rədd elə qəzanı.

* * *

Aç gül üzündə zülfünü, müşkin niqab elə,
Zülmət içində yəni cahanı xərab elə.

Aç gözlərin xumar elə, məst eylə nərgizi,
Bax, lalənin də qəlbini nazla kəbab elə.

Saç gül üzündəki təri işvəylə gülşənə,
Sən gülşəni xoş ətr ilə qərqi-gülab elə.

Getməkdədir ömür kimi gül fəsli, saqiya!
Şad eylə məclisi yenə meylə, rübab ilə.

Aç sən köpük kimi gözünü cam cəmalına,
Heçdir sonu, keçirmə həyatı əzab ilə.

Düz yar zülfünü üzə sən tər bənövşə tək,
Doldur çəməndə camını gülgun şərab ilə.

Məhv eyləmək bu aşiqi adət olub sənə,
Könlüm qanilə xəncərini gəl, xizab elə!

Bəxtimlə adətin mənə çoxdan əyan olub,
Mey ver rəqibə, qov məni kəskin cavab ilə.

Hafiz visal istədi səndən dua ilə,
Yarəb, duasını, nə olar, müstəcab elə.



* * *

Biz sərxoşuq, dayanma, dübarə piyalə ver,
Bədməst varsa, qəmzənə, saqi, həvalə ver.

Ay caminə şəfəq kimi, saqi, şərab tök,
Zülfünlə də o gün üzünə incə halə ver.

Ey piri-xanəgah, xərabatə qoy qədəm,
Yetmiş ilin hesabını bir an visalə ver.

Ağlar gözünlə, sufi, bu məclisdə gəl, şam ol,
Lazım gələrsə rəqsə bir ahəng, nalə ver.

Dövran verərsə kamını, Hafiz, gəlin kimi
Dünyanı sən, kəbin deyə, o gül cəmalə ver.

* * *

Sənsiz ürəyin səfası yoxdur,
Biganə tək aşinası yoxdur.

Hüsnün bazarında o cəlalla
Aşiqlərinin bahası yoxdur.

Saqilə gülü, könül, tələb et,
Dünya evinin əsası yoxdur.

Uçmuş ürəyim qəm etmərəm ki,
Zülfündən uzaq yuvası yoxdur.

Qorxum budur öylə bir diyarə,
Könlüm gedə ki, dəvası yoxdur.

Hər nə desən o gözəldə vardır
Əfsus! bizə vəfası yoxdur!

Aydır, o günəş üzündən ayrı,
Hafiz, ürəyin ziyası yoxdur.



* * *

Bu şəhr içində bəxtimizi etdik imtahan,
Köçmək gərək bəlalər içindən dayanmadan.

Əzbəs ki, mən bu yerdə yanıb, ah çəkmişəm,
Bir gül kimi olub ürəyim laxta-laxta qan.

Bülbül dünən çiçəklər içində nəva ilə,
Fəryad edib haray çəkib eylədi fəğan!

Səbr et, könül, nə qədr sənə zülm edərsə yar,
Zalim həmişə olmayıb aləmdə kamran.

Çatdırsa da riya selini əsr ərşədək,
Qoymaz bata ətəklərini arif heç zaman.

Yaxşı dolan həyatda bu xəlqi-cahan ilə,
Rəftar edə səninlə dilərsən əgər cahan.

Hafiz, müyəssər olsa idi kami-dil müdam,
Cəmşid kənar düşməz idi təxtü tacdan.

* * *

Yox bu dərdə bircə dərman ey haray!
Başa çatmaz qarə hicran, ey haray!

Aldı əldən dinimi, imanımı,
Düşmənimdir nazlı canan, ey haray!

Rəhmi yox, insafı yox, cəlladdır,
İstəyir bir busəyə can, ey haray!

Hardasan, ey vəsl, gəl imdad elə,
Könlümü hicran edib qan, ey haray!

Sındırır dostlar bütün peymanini,
Harda qaldı əhdü peyman, ey haray!

Hafizin sel tək axır göz yaşları.
Ta edə dünyanı viran, ey haray!



* * *

Hafizi-xəlvətnişin gəlmiş dünən meyxanəyə,
Sındırıb peymanını, peyman edib peymanəyə.

Gəncliyin əyyamını röyada görmüşdür yəqin
Əqlini tərk eyləyib dönmüş yenə divanəyə.

Dini, qəlbi qarət etdi getdi o tərsa gözəl,
Aşinadən əl çəkib, uymuş əcəb biganəyə.

Çöhrəsilə bülbülün od vurdu gül xırmanına,
Şam yanan ruxsarilə afat olub pərvanəyə.

Olmadı zaye mənim axir ki bu göz yaşlarım,
Qətrələr, şükr eylərəm, çevrildilər dürdanəyə.

Saqinin məxmur gözü əfsunlayır aşiqləri,
Virdimiz "əhsən" olub əllərdəki peymanəyə.

Sufi məclisdə dünən sındırdı səhba camini,
Bir qədəhlə ağla gəldi döndü bir fərzanəyə.

Kibriya dərgahıdır, Hafiz, sənin bu mənzilin,
Dilbərə dil vermisən, can bəxş olub cananəyə.

***

Həyat ətri alır, gəl ki, can o surətdən,
Könül tapır yenə də min nişan o surətdən.

Görəndə sərv sənin qəddini olub heyran,
Xəcalət oldu, gülüm, gülsitan o surətdən.

O şərhlər ki, mələkdən eşitmisən, indi
Soruş ki, eyləyəcəkdir bəyan o surətdən.

Belə müəttər edib zülfü, nafəni, müşki,
Alıbdır ətrini güllər, inan, o surətdən.

Baş əydi gülşənə gəldikdə yasəmən yarə,
Qızıl gülün ürəyi oldu qan o surətdən.

Üzün görəndə günəş tərlədi səmalərdə,
Düşüb yanar bir oda asiman o surətdən.

Damır sənin qəzəlindən həyat suyu, Hafiz,
Yəqin məlahət alıbdır nihan o surətdən.



***

Yaz, ey ürəyim, nigarə kağız,
Göndər o gözü xumarə kağız.

Hərçənd ki, bir cavab yazmaz,
Sən cəhd elə yaz, dübarə kağız.

Rəhm eylə səba, dayanma bir an,
Bizdən sən apar baharə kağız.

Dünyadə həmişəlik qalandır,
Çünki yazılıb o yarə kağız.

Yaz lütf eləsin sevimli dilbər,
Bu Hafizi-biqərarə kağız.

* * *

Zülfü gərdəndə, üzü gül kimi, ləblər xəndan.
Əldə mey camı qəzəlxan, pərişan, heyran.

Gözləri məst, dodaqlarda təəssüf, əfsus,
Gecənin bir yarısı gəldi sevimli canan.

Əyilib nazla başım üstə, həzin, bir səslə
Dedi: ey aşiqi-divanə məgər yatmışsan?

Gecə dildar əgər aşiqə meynab verə,
İçməsə, bağlamayıb eşq ilə əhdü peyman.

Zahida, man eləmə badəpərəst rindlərə,
Ruzi vermiş bunu əvvəldə bizimçün yaradan.

Hər nə tökdü qədəhə, biz də alıb nuş elədik,
Ya behiştdən gətirib, badəni, ya meyxanadan.

Dilbərin qarə teli, camda meyin qəhqəhəsi
Hafizə tövbə üçün vermədi bir gün imkan.



* * *

Gəldi şadlıq, ramazan getdi nihan oldu bu gün.
Taleyin ulduzu kamımca əyan oldu bu gün.

Söylə göylər qızına, aç üzünü məşriqdən,
Qoy baxım surətinə, başqa zaman oldu bu gün.

Suməə küncü, fəqət məskən idi aşiq üçün,
Bəxtə bax ki, bizə meyxanə məkan oldu bu gün.

Bülbülə söyləgilən, ahü fəğan eyləməsin,
Açdı gül, güldü çəmən, bağ cavan oldu bu gün.

Möhtəsib, rindləri boş yerə sən danlama çox,
Mey ilə, dilbər ilə eşq bəyan oldu bu gün.

Qoy desin xalq ki, Hafiz mey ilə, dilbər ilə,
Yenə gülzarə tərəf eyşə rəvan oldu bu gün.

* * *

Cami əlinə alanda dildar,
Bütlərdə kasad olur o bazar.

Üzdüm qəm içində mən balıq tək,
Lütf ilə tuta o nazənin yar.

Baş qoydum ayağına həvəslə,
Çünki əlinə ümid gözüm var.

Hər kəs gözünə baxıb çağırdı:
Məstanə gəlir, aman, bu xunxar!

Hafiz kimi şad olar həmişə,
Kim versə meyə əzəldə ilqar.



* * *

Qəmin ta könlüm ilə məhrəm olmuş,
Başım zülfün kimi eşq ilə dolmuş.

Alovlu ləblərin abi-həyatdır,
Həyatdır, bizlərə biganə qalmış.

Zamandır ömrümün hümmət hüması,
Gözəl qəddin həvasından ad almış.

Görüb gül qəddini mən aşiq oldum
Ki, aşiq min zəfər hər işdə çalmış.

Dayandıq mərhəmətli sayəsində,
Nədəndir sayəni əğyarə salmış?

Külək xoş ətr ilə oxşar cahanı,
Yəqin ki, çölləri yar seyrə dalmış.

Cahanə göz yaşım dürdanə səpdi,
Mənim iflasdən rəngim saralmış.

Kəlamı Hafizin, ey sərvi-rəna,
Sənin vəsfinlə dünyadə ucalmış.

* * *

Gəldi gül fəsli yenə rövneq ilə bostanə,
Çatdı gül müjdəsi o bülbüli-xoş əlhanə.

Ey səba, naz ilə sən gülşənə salsan yolunu,
Lütf ilə eylə səlam sərvə, gülə, reyhanə.

Etmisən ayə, əcəb, ənbəri-saranı kəmənd
Bir nəzər sal, nə olar, mən kimi də heyranə.

Qorxuram ki, bizə rişxənd eləyən zahid özü,
Gələ meyxanədə bir gün də gülə iymanə.

Cəhd elə mərd ilə yar ol, gəmisində Nuhun
Qorxu bilməz birisi düşsə əgər tufanə.

Çörəyindən yemə, gəl, sən fələkin, rədd eylə,
Bu qara süfrəlinin hörməti yox mehmanə.

Bu cürə naz eləyərsə bizə müğ badə satan,
Əbədi mənzilimiz olmalıdır meyxanə.

Bilməsən sirrini pərkar kimi dünyanın,
Dəyməsə başın əgər dayireyi-imkanə.

Hərənin qisməti axirdə bir addım yerdir,
Uyuruq şöhrət üçün dəbdəbəli eyvanə.

Yusifim, Misrdə məsnəd səni gözlər, bəsdir,
Əlvida söylə daha düşdüyün o zindanə.

Bilmirəm, mən yenə zülfündə nə sevda dolaşır
Ki, dağılmış o cürə hər birisi bir yanə.

Ayrı bir aləmi var fəqrdə azadəliyin,
Mümkün olmaz bu, qılınc ilə də o sultanə.

Hafiza, rindlik elə, meylə, nigar ilə, fəqət
Özünü bağlama təzvir ilə sən Quranə.



* * *

Üzün kimi ola bilməz günəşlə ay taban,
Boy atmayıb o boyun tək çəməndə sərvi-rəvan.

O ləli-ləb ki sənin var, tayı bərabəri yox,
Yetirməyib elə gövhər cahanda bir ümman.

O xəttü xalın içində şirin dodağın tək,
Həyat çeşməsini görməyib hələ insan.

Əsir edib aparır könlümü qara zülfün,
Nə yerdə bəs özünə məskən eyləsin iman.

Nə həddi var birinin oxşaya həyatda sənə,
Sənin kimi ola bilməz sevimli bir canan.

Zərif, şirin yaranıb şeri Hafizin amma,
Nə incədir, nə şirin zülfün ilə nazından.

* * *

Hüsnünlə naz birgə cəhanı yaman tutub,
Heç şübhəsiz ki, birlik edənlər cahan tutub.

Şəm istəyirdi faş edə əsrarı aləmə,
Yanmış dili başında, yamanca divan tutub.

Çox dəm vururdu gül də özündən qürur ilə,
Sübhün yeli gəlincə gülüstanda qan tutub.

Kəc qoydu lalə börkünü, dağlandı sinəsi,
Mey camını əlində o qəlbi yanan tutub.

Yandırdı eşq kasəsi atəşlə canımı,
Gördüm ki, saqi şəklini meydə nihan tutub.

Pərgar tək bu dairədən çıxmaq istərəm,
Bir nöqtədə fəqət məni dövri-zaman tutub.

Müğlərlə mən gərək gedib axirdə yar olam,
Fitnəylə çünkü dövrəmi ahü fəğan tutub.

Gül yarpağında qanla şəqayiq bu cür yazıb:
Arif şərab yox, dolu camında can tutub.

Mey ver, cahanda sirri görənlər piyaləni
Əsrar şərhinə açıb əldə bəyan tutub.

Mey ver Cəmin camıyla, səhər vaxtı məstlər
Gün tək cahanı zərli qılıncla əyan tutub.

Fövt etmə fürsəti, tutub afaqı fitnələr,
Mey sayəsində arif olanlar məkan tutub.

Bir şölədir sinəmdəki oddan yanan günəş,
Bir şəm tək əlində onu asiman tutub.

Bax Hafizin bu şerinə, ondan şəkər yağır,
Nöqsan tutubsa kimsə inan ki, yalan tutub.



* * *

Bütlərin eşqi zamandır ki, mənim dinimdir,
Bu yolun dərdi bütün qəmlərə təskinimdir.

Eşq şövq ilə fəqət çöhrəni görmək olacaq,
Din deyil şölə saçan, nurlu açıq eynimdir.

Eşqin öyrətdiyi gündən mənə söz söyləməyi,
Eldə bir söz var, o da hüsnünə təhsinimdir.

Fəqri çox görmə, xudaya, ki, böyük dövlətdir,
Bir kəramətdir o ki, həşmətü təmkinimdir.

Baxma təhqir ilə, vaiz, əzəmət satma mənə,
Şahların mənzili bu sineyi-miskinimdir.

Kim gəlir seyrə bu məqsud evinə, ya rəbbi?
Yolunun hər tikanı sünbülü nəsrinimdir.

Qəmər üzlüm, bizə yar ol ki, fələklər bəzəyi
Ay üzünlə axışan dürr kimi pərvinimdir.

Pərvizin həşmətini etmə hekayət, Hafiz,
Yarımın gül dodağı Xosrovu Şirinimdir.

* * *

Əgərçi badə fərəh bəxş edir bu dünyadə,
Oyan ki, darğa dayanmış sitəmlə amadə.

Unutma, hiylə ilə fitnə yağdırır əyyam,
Müyəssər eylə nigarinlə bir qədəh badə.

Piyaləni ətək altında sən nihan eylə
Ki, qanlı gözlə dönübdür zəmanə cəlladə.

Yuyun bu göz yaşını xirqədən şərab ilə,
Bu xoş fəsildə olun dərd-qəmdən azadə.

İnanma əyri fələk eyş üçün verə imkan
Ki, düz deyil ürəyi, mayil olsun imdada.

Hanı cahanda o Pərvizilə böyük Kəsra?
Həyat başlarını zərrə tək verib badə.

İraqı, Farsı tutubsan qəzəllə sən, Hafiz,
Gəl, indi növbə çatıb Təbriz ilə Bağdadə.



* * *

Badi-səba, səadət var isə hər nişanda,
Bəxş et bizim nigarə öz sevdiyin zamanda.

Qalmış gözüm yolunda, ey gizli peyki sirrin,
Sən ver xəbər o yarə gör bir qalıb hayanda.

Söylə hərayə gəlsin, əl üzmüşəm canımdan,
Ləli-ləbin olubdur dərmanımız cahanda.

Biganə bilməsin qoy mən yazdığım kəlamı,
Dərk et oxu özünçün xoş sandığın bir anda.

Təşnə su istər, ancaq vəslin qılınc olubdur
Öldür özün bilərsən hər yerdə, hər məkanda.

Ümmid bağladım mən beldə kəmərçinin tək,
Aləm var, ey əzizim, hərdəm onu açanda.

Türk də, ərəb də birdir eşq aləmində, Hafiz,
Öz sirrini bəyan et hər dildə, hər lisanda.

* * *

Qəriblik axşamı etdim namaz yerində fəğan,
Sənin o zülfünə açdım qəribə bir dastan.

Diyar, yar deyə, ağlayam gərək sel tək
Səfər xəyalını kökdən yıxıb edəm viran.

Həbiblər vətənindən yolum düşüb buraya
Yetir məni yerimə, saxlama daxi məhman.

Mənə kömək elə, ey qasidim, səni tari
Gedim o meykədəni eyləyim dübarə məkan.

Ağıl daha nə hesab istəsin, qocalsam da
Yenə gəlib, mənə bir növcəvan olub canan.

Səbadən özgə məni bircə yad edən yoxdur.
Külək olub gecə-gündüz bu qəmli halə yanan.

Gözüm yaşı üzümə eybimi sayır bir-bir
Evimdə olmuş imiş düşmənim mənim pünhan.

Deyirdi: nəğməsinə Hafizin mürid oldum,
Bu səs gəlirdi səhər Zöhrənin nəvasından.



* * *

Eşqin əcəb müğənnisi, sazı, nəvası var,
Hər çaldığı təranənin ayrı həvası var.

Aşiq fəğanı çulğalamış külli aləmi,
Qəlb oxşayan, fərəh dolu zövqü, səfası var.

Yoxsa əgərçi pirimizin malı, dövləti,
Xoş xülqü, gül üzü, dəxi lütfü, ətası var.

Əlbəttə ədldən uzaq olmaz, bu rəsmdir –
Bir padşah ki, qonşuda məzlum gədası var.

Şəhd aşiqi bu könlüm olubdur hüma mənim,
Çünki onun sənin kimi bir aşinası var.

Hər bir təbibə göz yaşımı vermişəm nişan,
Eşqin, deyib ki, sel kimi dərdi, bəlası var.

Zülm etmə qəmzə ilə mənə, rəhmə gəl bir az,
Eşq aləmində hər əməlin öz cəzası var.

Tərsa qızı, o badəsatan yaxşı söylədi:
İncitmə qəlbini o kəsin ki, vəfası var.

Sən Hafizin duasını, şahım, qəbul elə,
Dərgahının onun kimi bir mübtəlası var.

# Saqinamələr

* * *

Gətir saqiya, ruhuma ver səfa,
Könül dərdlidir, sən şəfa ver, şəfa.
Alarsa əlindən camı ruzigar,
Cəmə ruzigar bir məzardır, məzar.
Keçir ömr sürətlə, sal bir nəzər,
Keçən ömrü qoyma ki, getsin hədər.
Bacarsan əlindən yapış hər kəsin,
Yıxılsan əlindən yapışsın sənin.
Ədalətli olsa əgər hökmdar,
Gedərkən yerində gözəl ad qalar.
Nə əksən biçərsən, məsəldir, məsəl,
Qalan bu cahanda əməldir, əməl.
Dayanma cəhanə, bizə etmə naz
Ki, həm möhrəbazdır və həm hoqqabaz.

* * *

Gətir saqi, qəmdən şad olsun ürək,
Şərabınla bir dəm xoş olsun ürək.
Çalış qəlbini meylə mədhuş elə,
Cahan cümlə heçdir, meyi nuş elə.
Gətir saqi, yoxdur ömürdə vəfa,
Bu dərdə mey ilə sən eylə dəva.
Gətir saqiya, meylə bir kam alaq,
İçib ta mey ilə biz aram olaq.
Dözə bilsə insan əgər hicrana,
Könül çöndərər badədən üz yana.
Gətir saqiya, hiyləgərdir zaman,
Əgər vaxt çatsa, o verməz aman.
Fələk qəmlər ilə yaxarkən səni,



Çağır dadına sidqilə badəni.
Qürurlanma, saqi, yaxın gəl, yaxın,
Nə lazım ki, torpaqkən od olmağın?
Gətir, meylə dolsa qədəh xoş olur,
Riyasız olarsa bizə nuş olur.
Gətir, saqiya, ki, bu ləzzət qalar,
Cahanda nə dövlət, nə sərvət qalar.
Qızıl varsa hərgah verib badə al,
Özünçün nə varsa bu dünyadə al.
Gətir, saqiya, ləlvəş badəni,
Ala bəlkə qəmdən, kədərdən səni.
Bu təsbihü xirqə beladır müdam,
Uzaq saxla məndən daha, vəssəlam!
İçib məstlikdən ölərkən məni,
Tutarkən qara yerdə son məskəni.
Yapın tabutu siz mənə meynədən,
Uzaq olmasın qəbr meyxanədən.
Yuyarkən tökün üstümə badəni
Xərabatilər dəfn qılsın məni.
Məzar üstünə saqi səpsin şərab,
Çalınsın o dəmdə dəf ilə rübab.
Əgər eyləsə, çəng dad eyləsin,
Müğənni nəva ilə yad eyləsin.
Yıxıl, Hafiza, çıxma meyxanədən,
Xərac istəməz şah viranədən.

* * *

Gətir saqiya, öylə bir mey bu gün
Ki, ondan yaranmış mələklər bütün.
Gətir qəmlərə ta ki atəş vuraq,
İçib məst olaq, badəni xoş vuraq.
Gətir saqiya, sən bizi şad elə,
Könül bağını meylə abad elə.
Gətir ta içim yarımın eşqinə
Ki, od salmış eşqi könül mülkünə.
Gətir, qaçmıram, saqiya, badəni,

Ölərkən qədəhlə dirilt sən məni.
Ayaqdan salıb qəmlə namərd zaman,
Pənahimdir indi bu deyri-müğan.
Gəl ey saqi, çıxma gözəl deyrdən,
Xəzinə taparsan bu məskəndə sən.
Desə şeyx getmə o deyrə əgər,
Gecən xeyrə qalsın, de ki, müxtəsər.
Gətir saqi, cami, bizi eylə məst,
Könüllər mey ilə tapır mərifət.
Gətir qəlbimə bəxş qılsın səfa,
Yox olsun sinəmdən küdurət, cəfa.
Gətir bir su ki, odludur dəhrdə,
Ki Zərdüşt onu axtarır qəbrdə.
Təriqətdə birdir ki, rind olsa məst
Ya dünyapərəst ol, ya atəşpərəst.
Gətir saqiya, cami doldur yenə,
Behişt oldu məclis səninlə mənə.
Götür camı, etmə sən ayrı xəyal
Ki, cənnətdə badə, həlaldır, həlal.

* * *

Müğənni, dayanma bizə lütf elə,
Bir od vur mənim könlümə lütf ilə.
Gəl eylə özümdən xəbərsiz məni,
Dağıt qəmləri, başla, xoş nəğməni.
Nəzər qıl ki, olduq əcəb binəva,
Oxu sən müğənni, gözəl bir nəva.
Müğənni, sazınla gözəl nəğmə de,
Bizim dərdlərə çarə xoş nəğmədi.
Əraqi-nəva başlasın əldə rud,
Gözümdən açım mən də Zayəndərud.
Müğənni, yaxın gəl, eşit sən bunu,
Həkimanə sözdür, zərif məzmunu:
Səninlə sitəmlər əgər etsə cəng,
Düzülsün qabaqda rübab, nay, cəng.
Müğənni, mənimlə bir an məhrəm ol,



Neyinlə, meyinlə mənə həmdəm ol.
Mey ilə kənar et könüldən qəmi,
Bir an şadlıq eylə, burax aləmi.
Müğənni, nəva de, sən ilham ilə,
Gətir, saqiya, badəni cam ilə.
Yaxın gəl ki, bir yerdə eyş eyləyək,
Ataq qəmləri, badə nuş eyləyək.
Oxu məndən indi gözəl bir qəzəl,
Qəzəl meylə, neylə gözəldir, gözəl.
Oxu, vəcdə gəlsin sinəmdə ürək,
Atıb xirqəni, birgə rəqs eyləyək.

* * *

Gətir, saqiya, mey həyatdır, həyat,
Onunla tapım dərdü ğəmdən nicat.
Keçərsən o yeddi fələkdən yəqin,
Bu mey camı olsa əlində sənin.
Qədəh ver, əlindən öpək sidq ilə,
Ayağında başla duraq, eşq ilə.
Bu kənddə Səyavuşmənişlər də var,
Bütün pirlərə od vurub yandırar.
Atıb əqlini, durma, divanə ol,
İçib badəni dərdə biganə ol.
Bütün dərdləri durma ver bada, keç,
Yanar ah çəkmə, soyuq badə iç.
Mürid ol, kimin qəlbi huşyardır,
İçib dürdü indi, o, xummardır.
Çalışma cahanda uzun qalmağa
Ki, nakam gedərsən qara torpağa.

* * *

Dur, ey saqi, doldur yenə cam gətir.
Könül düşmüş əldən ona can gətir.
Bu kərpiclərin hər biri, bil yəqin,
Başıymış Qubadın və İskəndərin.

O güllər ki bağda açılmış bu an,
Olub bir gözəl çöhrəsi bir zaman.
O sərvin ki, vardır bu gün şöhrəti,
Olubdur gözəl bir gəlin qaməti.
Eşitdim ki, meyxanədə bir nəfər,
Deyirdi bu növ çox dərin nüktələr:
Əzər bu zəmanə sitəmlə səni,
Dənilər çaparlar açıq süfrəni.
Gözəllər qanından içib lalələr,
Edir şahların torpağı nalələr.
Fələk sürət ilə ki dövran edir,
Sənin bağrını zülm ilə qan edir.
Gətir, saqi, xoşdur, demə təlxdir,
Meyi yar əli çünki nuş etdirir.
Ki Dara tək idi həyatda o gün,
Cahan baş əyirdi önündə bütün.
Köçərkən həyatdan nə qalmış ona?
Nə təxti, nə tacı çatıb dadına.
Düşün bunları, nuş qıl badəni
Ki, hüşyar edər badə hər an səni.
Bu dünyayla bu mavi gözlü fələk
Şikar olmayıb heç kəsə, əl çəkək.
Qədəm qoy ümidlə o meyxanəyə,
Mürid ol sədaqətlə məstanəyə.
Mey ilə verər o sənə xoş həyat,
Kədərdən, ələmdən, bəladən nicat.
Özündən mey ilə olarsan kənar.
Düşər pərdə, məlum olar hər nə var.
Bilərsən ki, Hafiz qıyıb canına,
Özün tərk edib, çatdı cananına.

* * *

Gəl, ey saqi, badənlə ruh bəxş elə,
Çıxım seyrə tainki mən Rəxş ilə.
Təhəmtən kimi üz qoyum meydana,
Könül mərkəbim başlasın cövlana.



Gəl, ey saqi, söylə o sultanə sən:
Düşün, fikrə dal, bircə, kimsən, nəsən?
Sitəm eyləmə xəlqə, insaf elə,
Könül lövhini zülmdən saf elə.
Gətir, saqiya, öylə bir cam ki, Cəm
İçərkən gedərdi bütün dərdü qəm.
Gətir, ta içim, Cəm kimi şad olum,
Duyum aləmi, qəmdən azad olum.
Gətir, saqi, qüdrət verə ta ki, mey,
Deyim hardadır indi Kavus Key.
Deyim məstlikdə nədir sirrlər,
Özündən xəbərsiz verər çox xəbər.
Gətir, saqiya, badə əksilə cam
Cəmə, Xosrovə bir aparsın peyam.
Gətir ta dedirtsin mənə meylə ney,
Var imiş cahanda nə Cəmşid, nə Key.
Gətir ki, məni badə şad eyləsin,
Könül canə gəlsin, az ah eyləsin.
Gətir, eybimi pak qılsın şərab,
İçim keyf içində olum mən xərab.
Gətir, saqiya, ta çıxıb ay kimi,
Süzüm asimanda qızıl yay kimi.
Uçum göylərə, seyr edim aləmi,
Neçün mən olum qəmlərin həmdəmi?
Gətir cami, saqi, içim məst olum,
Düşə cənnətə məstlikdə yolum.
İçim, ta çatım burda mən dövlətə,
İçim, yol tapım burda hər hikmətə.
Gətir, saqi, köhnə şərab ilə mən
Bir anlıq kənarə düşüm əqlidən.
Əgər məst qılsan, sözüm var sənə,
Sözüm sirrlər eylər aşkar sənə.
Əgər Cəm kimi badə alsan ələ,
Bilərsən nə var, badə al sən ələ.
Bu halətlə şad ol, fəqirsən əgər,
Təmizlik, fəqirlik cahanə dəyər.
Əgər məst olub çalsa Hafiz rübab
Fələkdən verər Zöhrə rudla cavab.

* * *

Gətir, saqiya, sağəri, səhbanı,
Ataq biz nəzərdən iki dünyanı.
Tez ol, durma, doldur, o cami yenə,
Görən varsa, gizlin yetir sən mənə.
Gətir ki, fələk çoxlu işlər edib,
Neçə Tus, Bəhram cahandan gedib.
Çoxu fil dalında təbil çaldırıb,
Yerindən təbillə fələk qaldırıb.
Qalan burda yeddi fələkdir fəqət,
Qalan hər nə varsa, kələkdir fəqət.
Bir evdir ki, altı yolu var onun,
Baxırsan-keçirsən, bu olmuş sonun.
Ucal, göyləri sən də eyvan elə,
Könül aləmində otur can ilə.
Gətir, saqiya, ömrə yoxdur vəfa,
Baxıb göz açınca olursan fəna.
Sinəm dağlanıb, odlanıbdır ürək,
Gətir bir su ilə onu söndürək.
Hekayət edirlər ki, iman ilə,
O, Buzərcümehr, əql, ürfan ilə.
Ənuşirəvanın yazıb caminə:
Mey ilə fərəh ver sən öz caninə.
Əgər Zalın oğlu və ya dul qadın,
Kim olsan, gedərsən, çəkilməz adın.
Eşit məndən, ey pir, ol huşiyar,
Dayanma cahanə, ötür ruzigar.
Bu mənzildə qəmdən səvay heç nə yox,
Fərəhdən əsər yox, kədər, qüssə çox.
Gətir ləl rəngli qızıl badəni,
Gətir ləldən də gözəl badəni.
Tələs, tez gətir, sən, amandır, aman,
Günəşdir, qədəhdə olubdur nihan.
O şahlar ki, burda olurlardı şad,
Keçib getdilər, kimsə eylərmi yad?
Hanı Cami-cəmlər, o dövran hanı?
Üzük harda qaldı, Süleyman hanı?



Hanı filosoflar, desinlər görək,
Hanı Cəmlə Kavus, nə etmiş fələk?
Gedərkən həyatdan o şahlar tamam,
Quru ad qoyub hər biri, vəssəlam.
Yapışma cahandan, gedərkən sənin,
Bir addım məzardır fəqət məskənin.
Burax aləmi, məsti-divanə ol!
Ona aşina olma, biganə ol!
Bu mənzildə mümkün deyil heç də kam,
Gedər əldən artıq cəlalü məqam.
Çalış beşcə gün ta şən olsun ürək,
Burax qoy dolansın bu yeddi fələk!

* * *

Gəl, ey saqi, mey ver, atım qəmləri,
Fərəhlə keçirdim ötən dəmləri,
Firidun kimi Kaviyani ələm
Ucaldım, görüm ki, hanı Cami-cəm?
Eşit gəl nələr söyləyir ta bu ney,
Keyin dəstgahından şirindir bu mey.
Danış, deyrdən, badədən, pirdən,
Ötən şahları yad elə burda sən.
Gəl, ey saqi, bu kimyayi-zəfər
Bizə Nuhların ömrünü bəxş edər.
Gətir ki, açılsın səadət yolu,
Uzun ömr, istək, məhəbbət yolu.
Gətir, saqiya, ərğəvani qədəh
Ki, nəşəylə versin bizimçün fərəh.
O mey ki, olubdur xilaskar bizə,
Gətir taki olsun o qəmxar bizə.
O meydən gətir ki, mənə can verir,
Şirindir o badə ki, canan verir.
Gətir ki, çıxım ərşi-əlayə mən,
Baxım aşiqanə bu dünyayə mən.
Gətir, hal gətirsin bu hal ilə mey.
Kəramət yetirsin kəmal ilə mey

Sürahi gətir, tut əlimdən mənim,
Xəbər gəlmədi hasilimdən mənim.
Gətir, fikri, əqli, dili odlasın,
Şir içsə durub cəngəli odlasın.
Çıxım cəngə əflakdə şir ilə,
Bu qurdun evin məhv edim zur ilə.
Gətir, istərəm mən ki, bədnam olam
İçəm badəni, camdən zövq alam.

* * *

Yenə fitnələr yağdırır ruzigar,
Mənəm, məstlik, bir də nazlı nigar.
Edibdirsə də matu heyran məni,
Tuta bilmir ancaq bu dövran məni.
Dönür hiylə ilə əzəldən fələk,
Doğur sübh olanda, gecə boylu tək.
Könül, dünyadan sən kənar ol kənar
Ki, tutmaz biri körpü üstə qərar.
Bu dünya o çöldür, haman qurğudur
Ki, orduyla onda itib Səlmü Tur
Bu viranə mənzil o vaxtdan qalıb
Ki, Əfrasiyab onda eyvan salıb.
De Piran hanı, harda olmuş nihan?
Hanı Şiydeyi-türk, mərd qəhrəman?
Demə qəsrini təkcə bərbad edib,
De ki, onları bircə kim yad edib?
Gözəl söyləmiş Cəm də bu dünyaya
Ki, dəyməz həyat bir çürük arpaya.
Müğənni, dayanma, götür rud ilə,
Gözəl nəğmə de, könlümü şad elə.
Ümid ver səsinlə mey içmişlərə,
Salam söylə həsrətlə keçmişlərə.
Çal o çəngini ərğənun üstə sən,
Cahan fikrini tərk edim bəlkə mən.
Atım qəmləri, bəlkə rahət olum,
Bir anlıq həyatda fərağət olum.



Yenə Xosrəvani bir ahəng çal
Ki, alsın təranəylə rudun məlal.
Bir ahəng çal ki, şən etsin bizi,
Silinsin qəzəllə kədər, qəm izi.
Məni qəm yükü tikdi güclə yerə,
Qopar zərb üsulilə birdən-birə.
Çalış pərdədən bir hava qıl kənar,
Görək ta nə söylər bizə pərdədar.
Elə bir nəva çal bu gün rəqsdə
Ki, Nahid göydə duyub rəqs edə.
Müğənni, dəfi, çəngi dur saz elə,
Cavab ver nigarə, xoş avazilə.
Elə nəğmə de, sufi ta mat qala,
Visal istəyə, məstü heyran ola.
Müğənni, mənimlə nə dəva gərək,
Dəfə sillə vur, nəğmələr dinləyək.
Hücum eyləyərsə kədər, qəm əgər,
Dəfin nərəsi bil ki, məğlub edər.
Müğənni, dayanma, gül açdı bahar,
Quşun nəğməsilə dolub laləzar.
Mənə ruh gətir xoş bir ahəng ilə,
Mey ilə, ney ilə, dəfü çəng ilə.
Ud ilə bizi şad, məsrur elə,
Yeni nəğmələr de, yeni şur ilə.
Təranənlə bu dərdə bir çarə et,
Mənim könlümü xirqə tək parə et.

# Məsnəvi

Gəl ey vəhşi maral, gəl hardasan sən?
Səninlə bir qədər söhbət edim mən.
İki tənha, iki yalqız pərişan,
İki yol ayrımında matü heyran.
Yaxın gəl, dərdliyik, həmdərd olaq biz,
Könüldən yar olub, həm dərd alaq biz.
Nə çöldür, hər tərəf qəmdir, xəzandır?
Çiçəksiz, lalesiz, hər yan tikandır.
Bu qəmlərlə bizə qəmxar olan yox,
Qəriblik, bir nəfər dildar olan yox.
Məgər ki, Xizr gəlsin dadə çatsın,
Bu yerdən çıxmağa bir yol yaratsın.
Məgər lütfilə bir həmdərd gəlsin,
Ki, falım "Latəzərni fərd" gəlsin.
Deyirlər, bir nəfər keçmiş zamanda
Deyirmiş dostuna yad bir məkanda
Ki, ey salik, davarcıqda dənin var?
Gətir tor qur ki, düşsün bəndə quşlar.
Cavab vermiş: buyur, bu sən, bu da dən,
Fəqət Simürğü tutmaq istərəm mən.
Dübarə söyləmiş: gəzmə cahanı,
Bu dünyadə onun yoxdur məkanı,
Uçubdur çünki o dünya üzündən,
Qaçıb xalqın nihan olmuş gözündən.
Götür camı, gül açmış bağ, gülşən,
Vəlakin, qafil olma çərx əlindən.
Otur bir guşədə, sən işrət eylə,
Düşün tənha, özünlə söhbət eylə
Gətir keçmişləri, keçsin gözündən,
Soruş ki, hardadır, sən öz-özündən.
Keçən keçmiş, özünçün indi ağla,



Əlində varikən ömrü qucaqla.
Gedib yarım mənim əldən zamandır,
Musəlmanlar, müsəlmanlar, amandır!
Elə bir zərbə vurmuş qarə hicran
Ki, dostun varlığı çıxmış yadımdan.
İki tənha, biri yarım, biri mən,
Nə cür gəlsin visal Xizrin əlindən?
Fəqirlik şərhini mən etsəm izhar,
Günəş göydən yerə zər eylər isar.
Görüb bu gövhəri xərmöhrədən keç,
Çalış yaxşı-pisi əqlinlə sən seç.
Bu minvalla əgər bir söz yazam mən,
Sual et şərhini "nun vəlqələm"dən
Ki, cəmdir orda hər hikmət məqalı,
Açar bir-bir nədir hicran məlalı.
Qatıb əqlilə ruhu ilk əzəldə
Yeni bir danə etdi, əkdi çöldə.
Ümidin ətrini al hasilindən,
Həyatın camını salma əlindən.
Bu nafə bir ilahi ahudandır,
Nə bir ceyran ki, insandan qaçandır.
Bu çöldə cəng söylər pərdə-pərdə
Ki, yüz məzlum qanı heçdir bu yerdə
Ətəklə körpələr od yandırırlar,
Gələrsə Cəbrail də, yandırarlar.
Danışmaq kimlərə burda yar olmuş,
Təalallah, nədən kimlər xar olmuş?
Dayan, Hafiz, bu haqda vurma sən dəm.
Sözü kutah elə "Allahü ələm".

# Rübailər

* * *

Əyləşib yarınla iç mey camından,
Busə al istəkli güləndamından.
Yaralı dərdinə dava istəyər,
Sən də bir söhbət aç öz məramından.

* * *

Dedim ki, yığılsın dövrəmə əshab,
Bahardır tərk olsun artıq bu meynab.
Çəməndən bülbüllər haray çəkdilər:
Dərdlərin dərmanı şərabdır, şərab!

* * *

Günün kölgəsidir qara tellərin,
Çöhrəndən nur alıb üzü qəmərin.
Gecələr xəttindən bir nişanədir,
Bəzənib hüsnünlə üzü səhərin.

* * *

Eşqin bu könlümü qan eyləyib, qan,
Hüsnünün hüdudu ötüb idrakdan.
Zülfündə qəribdir biçarə ürək,
Zülmətlər içində heyrandır, heyran.

* * *

Göz açıb düşəli eşqin toruna,
Qəmlər bir yük oldu qəlbin boynuna.
Həyat şərbətindən məhrum olmuşam,
Dönübdür ürəyim kədərdən qana.



* * *

Mey iç ki, əbədi həyat budur, bu,
Bu fani həyatda həyat qurur bu.
Gül fəsli yar-yoldaş hamısı məstdir,
Şadlıq et həyata ziynət verir bu.

* * *

Ruhuma aynadır yanağın sənin,
Gözümə sürmədir torpağın sənin,
Deyərdim: gözümün üstündən yeri,
Qorxuram, inciyər ayağın sənin.

* * *

Əvvəlcə mey verib, vəfa eylədi,
Elə ki məst oldum, cəfa eylədi.
Ürəyin atəşi, gözün yaşıyla
Düşdüm ayağına, fəna eylədi.

* * *

Bu gül bir nazənin nigardan gəlib,
Ürəyi şad edən bahardan gəlib.
Bilirsən nə üçün sevirəm onu?
Xoş ətri sevgilim dildardan gəlib.

* * *

Badəylə, yar ilə bağa getməli,
Qüssənin yanından yel tək ötməli.
On gündür ömrümüz, qafil oturma,
Gülüb bir gül kimi işrət etməli.

* * *

Qönçələr yenə də gəlmiş gülşənə,
Nərgizin gözləri xumardır yenə.

Xoş onun halına ki, cam içində,
Üzür köpük kimi hey dönə-dönə.

* * *

Ürəyim zülfündə məkan istədi,
Bəladən, zillətdən aman istədi.
Can verdim töhfə tək hilal qaşına,
Baxma ki, o, məndən mərcan istədi.

* * *

Ayın sarayında gəzir camalın,
Qürurla göylərdə uçur xəyalın.
Yalançı, hiyləgər, deyirsən bizə,
Görərik kimindir sonu bu halın.

* * *

Zər ilə mümkündür yar olsun şikar,
Zər ilə bizlərə şikar oldu yar.
Nərgiz ki, gözəllər şahıdır bağda,
O da zər önündə qalıbdır xumar.

* * *

Gözəllər çatdırmaz başa peymanı,
Aşiqlər qurtarmaz bəladən canı.
Məşuqu kamincə olan aşiqin
Aşiqlər içində gəzməz dastanı.

* * *

Mən zövqü olanın quluyam, qulu,
Budur insanlığın həyatda yolu.
Eşqin ləzzətini anlaya bilməz
Bu meydən içməyib kim qədəh dolu.



* * *

Zülm olsa, hədərdir dünya dövləti,
Qəm olsa, heç olar varlıq ləzzəti.
Min ilin eyşini verəcək yelə
Bir günün kədəri, qəmi, möhnəti.

* * *

Yeridir ki, dostlar, şad olsun hamı,
Məşuqla bir yerdə doldursun camı.
Şərabla, qədəhlə dirildək gərək
Ömür yollarında ölən əyyamı.

* * *

Hicranın yapışıb mənim yaxamdan,
Yarama duz səpir bu acı hicran.
Qorxurdum ayrılam mən bir gün səndən,
Qorxduğum başıma gəldi, ey canan!

* * *

Nə olar baxarsa gözlərin mənə,
Aydan da nur yağır yerin üzünə.
Məzarda olarsam çağırma məni,
Qoy səsin düşməsin torpaq üstünə.

* * *

Dostlarım nə üçün düşmən oldular?
Bu yolda az gedib, çox yoruldular!
Deyirlər gecələr ikicanlıdır,
Kişi yox, bəs kimdən nütfə aldılar?!

* * *

Bəxtimiz bizimlə, nəsə, yar deyil,
Ruzigar müvafiq ruzigar deyil.

Yar gözün nuruydu, gözümdən getdi,
Nursuz göz həyatda bəxtiyar deyil.

* * *

Cavanlıq çağında şərab gözəldir,
Məstlərə həmişə meynab gözəldir.
Yer üzü xərabdır, içib yıxılaq,
Xərabə yanında xərab gözəldir.

* * *

Sel axır ömrümün kaşanəsindən,
Mey gedir ayrılıq peymanəsindən.
Ey xacə, bu illər gəlib aparsın,
Bizləri həyatın viranəsindən.

* * *

Yapışdım zülfündən o dilbərin mən,
Dedim ki, rəhm eylə, öldüm dərdindən.
– "Zülfü at, ləbimə mayil ol, dedi,
Xoş gün tap sən, əl çək uzun ömürdən".

* * *

Qəmindən yatmadım gecə sübhədək,
Kirpiyin ucundan gövhər səpərək.
Dərdini heç kəsə açmaz dünyada
Eşqinlə çırpınan bu yazıq ürək.

* * *

Ey dostlar, rədd edin azğın duşməni!
Mey ilə, mütrüblə dindirin məni!
Siz sənət əhlilə oturun, durun,
Naəhlə deməyin: "başa düş məni".



* * *

Gözünün ustadı Babil sehridir,
Əfsunlar ustadı nazlı pəridir,
O zülf ki, sallanıb şux gərdəninə,
Hafizin şerinin oynaq yeridir.

* * *

Çəməndə güllərin camalına bax,
Buludun kədərli əhvalına bax.
Sərv azad olsa da, quldur o, gülə
Sən gülün hüsnünə, cəlalına bax!

* * *

Boyasız seyr elə gözəl cananı,
Misilsiz hüsnünə bərabər hanı?
O büllur sinədə görünür qəlbi
Görürsən bulaqda sanki mərcanı.

* * *

Yadına salmadın Hafizi, ey gül,
Ayrılıq mənimçün müşküldür, müşkül;
Sinəmdə toplanan ələmlərini
Mən bildim, bir də ki, yaralı könül.

* * *

Mey dolu cam ilə biz dilşad olaq,
Keçənə, ötənə daim yad olaq.
Qurtaraq zindandan ruhu badəylə,
Ağılı tərk edib, biz azad olaq.

* * *

Çəməndə quşların gəlir avazı,
Çalınır gülşəndə səadət sazı,

Küləklər ləbindən hekayət deyir,
Yarımdan söz açıb xilqətin yazı.

* * *

Bir gecə ömr etdim səninlə, canan,
Canımı eylərəm canına qurban.
Ölmərəm həyatda, həyat suyunu
İçmişəm ləlinin gül bulağından.

* * *

Öldüm bir busənin xəyalilə mən,
Öldüm o ləlinin visalilə mən,
Nə deyim, sözümü qoy kutah edim,
Dadə çat, ölürəm, bu hal ilə mən.

* * *

Vuruldum sənin tək gözəl canana,
Ayrılmam həsrət də qalarsam cana.
O yaqut ləblərin canımdır mənim,
Verməərəm bir dünya ləlü mərcana.

* * *

Ömrümün hasili dərdü qəm oldu,
Eşqində həmişə qəm həmdəm oldu.
Bir munis görmədim ələmdən başqa,
Qismətim yəs ilə bu matəm oldu.

* * *

Ey səba, xəbər ver gözəl canana,
Kədər, qəm gəlməsin heç zaman ona.
Yatmısan naz ilə yatağında sən,
Aşiqin ürəyi dönübdür qana.



* * *

Daim yol gedirsən əməl çölündə,
Güneşi gizlədib zülmət gilində,
Təməhdən girirsən şirin ağzına
Məhkumsan axırda əcəl əlində.

* * *

Təbəssüm utanır şirin sözündən,
Xumardır nərgiz də məxmur gözündən.
Gül necə səninlə bərabər olsun,
Ay səndən nur alır, o ay üzündən.

* * *

Olarsan məstanə mənim tək müdam,
Alarsan əlinə mey dolu bir cam.
Biz rindik, aşiqik, qorxumuz yoxdur,
Bizimlə oturma, olarsan bədnam.

* * *

Gül dedi, qaçmağa yolum olsaydı
Qaçardım ayağım əlim olsaydı.
Günahsız, söhbətsiz yanıram belə,
Gör nələr çəkərdim dilim olsaydı!

* * *

Hafiz, gəl yığışdır söz büsatını,
Hiylələr əlindən al səbatını.
Sakit ol, sakitlik vaxtındır sənin,
Mey ilə başa vur öz həyatını.

# Qitələr

* * *

İki şüşə mey ola, nazlı yar, bir də ki, mən,
Kitab, vaxt, fərağət, yaşıl geyimli çəmən.
Cahan dalımca düşə, iltimas edə hərgah
Həyatımı verərəm, keçmərəm bu işrətdən!

* * *

Xalq mey qədrini bilərsə əgər,
Gecə yatmaz, yəqin ki, meynə əkər,
Meynəni uddən edər bağda,
Əyləşib dövrəsində növbə çəkər,
Dayə tək salxımı böyütmək üçün,
Dayanar qulluğunda bir dilbər.

* * *

Kimdir gedib o həzrəti-sultanə söyləyə:
Ölmüş dəvə, pişikləri məşhur edib zaman,
Bir bic gəlib deyir ki, məni göndərib qəza,
Bir gic də söyləyir ki, mənəm xalqa hökmran,
Ey Asəfi-zəmanə, sən, Allah rizasına,
Bir lütf qıl ki, oldu bizim halımız yaman.
Dövründə qoyma ki, belə alçaqlar alçağı,
Biçarə xalqa böylə tuta zülm ilə divan.

* * *

Bir gün şərab camə böylə xitab qıldı:
Dörd gövhərəm həmişə mən dörd məkan içində.
Göy zümrüdəm meynədə, piyalədə əqiqəm,



Küpdə Süheyləm, ancaq günəm cama keçəndə,
Ancaq haram deyirlər bir böylə iqtidarla
Ayırmış o haramdan halal məni içəndə?

* * *

...Dünən gecə yuxuda görmüşəm ki, sultanın,
Yolum düşüb gəzirəm tövləsində pünhani,
O başda bir axura bağlanıb minik qatırım,
Görəndə nərə çəkib söylədi, salamın hanı?
Nə görmüşəm yuxuda mən həyatda heyranəm,
Özün fikirləşib aç sən bu dərdli mənanı.

* * *

"İt elə şəxsdən əzizdir ki,
Toxunub incidə bir insanı"[1]
Var bu sözdə böyük həqiqətlər,
Duysalar onda incə mənanı.
İki insan bir evdə loğma kəsir,
İtə yoxdur bu ləzzət imkanı.
İt vəfasız deyildir insanə,
Didir ancaq ki, insan insanı.

* * *

Bir zaman dövlət üçün səy elədim aləmdə,
Gördüm axırda bütün mənfəəti oldu zərər.
Hər nə vermişdi təbiət, tutub aldı bir-bir,
Getdi əfsus, cavanlıq! Gələcək bir də məgər?
Ömrümüz oldu fəna, mal hanı? Sərvət nə gərək?
Betər oldu hamı qəmdən bu müsibətlə kədər.
Qoymaram boş keçə bundan belə əsla, əsla!
Ömrümün bircə dəmi hər iki dünyayə dəyər!

[1] Beyt Sədinindir.

Xəznələr tapdı ürək indi bu viran sinədə
Fikrətim bəhr kimi saçmadadır dürr, gühər.
Hər nə gəlsə əlinə, Hafiz, əgər az ya çox,
Şən yaşa, qəmlər ilə eyləmə sən ömrü hədər.

* * *

Şerim bənövşədən də çəməndə gözəl olub,
Bağlaşdı çöldə də alagözlü ğəzal ilə.
Hər kəs desə nəbatə acı vay kəmalinə,
Olmaz yəqin ki, ağzı şirin bu zülalilə.
Hər kəs ki, kor doğuldu həyatda, nə anlayar
Yar olmağı o dilbəri-sahibcəmalilə.



# Şahbeytlər

* * *

Könül, zülfündə dad etmə pərişanlıq əzabından,
Qızıl quş bəndə düşdükdə gərək dözsün vüqar ilə.

* * *

Gəl, ey Yusif, ki, sultanlıq edibdir Misrdə məğrur,
Atandan bir xəbər tut sən, uşaqlıq əhdini yad et.

* * *

Behiştə, zahida, dəvət buyurma,
Bu gülgün çöhrəni yüz bağə verməm!

* * *

Mənimlə zahidi bir gördü dövran,
Kora çirkin, gözəl, düzdür ki, birdir.

* * *

Məni məst eyləyib gizlənmə, saqi,
Şəkər verdin, zəhər lazım deyildir.

* * *

Atıbsan dostları düşmən sözüylə.
Görüm ki, olmasın heç dostu düşmən.

* * *

Zamanın qəmləri salmış ayaqdan,
Deyin mey kasəsi tutsun əlimdən.

* * *

Gəl, ey ümmid sabahı, al günəşlə!
Əsirəm mən şəbi-hicran əlində.

* * *

Məni aldatma, vaiz, körpələr tək,
Qızıl alma, şirin süd söhbətilə.

* * *

Əfsus, cavanlıq qoca vaxtda yada düşdü,
Sirr gəldi könüldən dilə, ağzım dada düşdü

* * *

Göz pəncərəsindən ürəyim uçdu həvayə,
Gör harda qanad çaldı o, harda oda düşdü.

* * *

Gündən-günə artır sənin o hüsni-camalın,
Kimdir, nədir ay çöhrənə dünyada tay olsun?!

* * *

Dostluq ağacı ək ki, şirin meyvə gətirsin,
Düşmənçiliyin hasili bir parça zəhərdir.

* * *

Yad eylədim o gül üzünü sübhə qədər mən,
Naləm, harayım yerdən ucaldı aya çıxdı.

* * *

Saqi, çəmənin sənsiz yox rövnəqi dünyadə,
Gül sərvi-xuraman tək, gülsün üzü gülzarın.



* * *

Artıq qocalıb getdin, get meygədədən, Hafiz,
Xoşdur belə sevdalər gənclikdə-cavanlıqda...

* * *

Doldur qədəhi ki, eşq ucundan –
Baxma qocayam, hələ cavanəm.

* * *

Bir zamanlar istər idim seyr edəm gülşənləri, –
Döndəribdir gül üzün keçmiş xəyalımdan məni.

* * *

Hafizəm, məclisdəyəm, meynab əlimdə məst-məst!
Gör necə xoş hal ilə xalq ilə söhbət eylərəm.

* * *

Neyləsin dövran dalınca getməsin pərgartək
Kim ki, əsrin gərdişində düşdü gün dövranına.

* * *

Gizli mey içmək gətirmiş təngə axır Hafizi,
Gəl dəfin, çəngin səsilə aç onun əsrarını!

* * *

Zərrədən əskik deyilsən, cəhd elə alçalma sən,
Qalxasan öz səyin ilə ta günəş dərgahına.

* * *

Mey çırağı yanmasa, xəlvətdə mən əyləşmərəm,
Novbaharda gül açarkən təkcə nadan gizlənər.

* * *

Müntəzirdir xalq görsün çöhrəni, ey gül, sənin,
Örtüyü at bir kənarə, qönçə tək çıx pərdədən.

* * *

Qocalar təcrübə ilə danışar, mən deyirəm:
Saçım ağdır, sizə də beylə qara gün gələcək!

* * *

Göz dəyər, sən ki, bu hüsn ilə keçirsən küçədən,
Hafizə bir dənə busə nəzir eylə, gözəlim.

* * *

Yüksələr müşki-Xütən ətri bizim İrandan,
Çünki o gül nəfəsin gülşən edib çöllərini.

* * *

Ay deyir ki, sənə o surətinin bənzəri var,
Çöhrəni göstər ona, qoy hamı gülsün sözünə.

* * *

Sən güman etmə ki, dünyadə səbat olmalıdır,
Bu belə karxanadır ki, gecə-gündüz dəyişir.

* * *

Adını yaxşı diləsənsə, pisə yar olma,
Yaxşının pisliyinə yaxşı nişan pislər olur.

* * *

Aç gözəl çöhrəni, çıx seyrə, görənlər baş əyib,
Səcdə etsin o xətü xalına min əhsən ilə.



* * *

Hafizin qəmlə yanan könlünü almaz dildar,
Eybi var, çünki sınıqdır, nəyə lazım bu? Deyir.

* * *

Sübhə tək vüslətinin ətrini mən almaq üçün
Qoymuşam yellər önündə gözümün şamlarını.

* * *

Qol-qanad tapsam əgər eşqdə pərvanə kimi,
Şam üzündən uzağa uçmayacaq odlu könül.

* * *

Qırmızı meylə dolu camə baxıb həsrətdən,
Ləbin öpmək üçün könlümü qan eyləmişəm.

* * *

Odla su ləli-ləbində qarışıb bir-birinə,
Yaxşıca şəbədədir, gəlməyəsən pis gözə sən.

* * *

Qəmini çəkmə, könül, sən bu dəni dünyanın,
Çox heyifdir ki, gözəl eybəcər aşiq ola.

* * *

Hafizin şeri mənə dadlı həyat şərbətidir,
Həkimin nüsxəsini at, daha lazım deyil o.

* * *

Zülfünün ətri mənim könlümə qüdrət verdi,
Eşqdə cazibəsiz faydası yoxdur təlaşın.

* * *

Hanı bir arif adam ki, soruşa nərgizdən,
Bu açıb solmaq ilə xalqa nə hikmət söylər.

* * *

Ölçələr bir tərəziylə hərənin hasilini,
Əksilər sumədən bəlkə bu nadan kişilər.

* * *

Tazə şeir ilə, ney ilə xoş olur rəqs, bəli,
Yar əli əldə olarsa daha da şirin olar.

* * *

Tutma dik boynunu sən, çox ki qızıl tacın var,
Kim papaq qoysa deməzlər başı var aləmdə.

* * *

Dünyanın qəmlərini çəkmə, gətir badə içək,
Arifin qəlbi, heyifdir ki, pərişan olsun.

* * *

Məclisin alimine bir sualım var, soruşun:
Tövbəyə əmr verənlər niyə az tövbə edər?

* * *

Ey haray, sərraf əlindən, o qədər nadandır,
Dürrü xərmöhrə ilə bir eləyir qiymətdə!

* * *

Təkcə eşqin sözüdür ki, təzə bir nəğmə kimi
Yadigardır əbədi köhnə fələk tağında.



* * *

Kim sənin xəttin ilə xalına məftun olsa,
Hüsnünün dairəsindən çıxa bilməz kənara.

* * *

Yarın əfsanəsi yuxlatdı mənim taleyimi,
Hanı sübhün yeli, lütf ilə aça gözlərimi?

* * *

Qan saçan şerimi, ey dost, aparıb yarə oxu,
Qəlbimə kirpiyi, görsün ki, necə yarə vurub.

* * *

Göy, sənət əhli görəndə gəmisin qərq eləyir,
Bu mayallaq dənizə təkyə nə lazım eləyək?

* * *

Zülfünü vermə yelə, bağrımı al qan eləmə!
Tikmə naz qəsrini sən, könlümü viran eləmə.

* * *

Gülü tərk etmək üçün aç o gözəl surətini,
Baxmayım sərvə deyə, göstər o şux qamətini.

* * *

Deməyin ki, necə sədr oldu qəzəl məclisinə,
Neçə il Sahibi-divanə qul oldum burada.

* * *

Məst olub mən uca səslə deyirəm dünyayə
Ki, qədəhdə arayın siz həyatın nəşəsini!

* * *

Bilmirəm heç ki, əlindən o qara tellərinin,
Mən pərişanlığımı yarə nə cür şərh eləyim.

* * *

Rindü dildarpərəstəm, mey ilə məstü xərab
Necə örtüm bunu mən məkr ilə, təzvir eləyim?

* * *

Hafiza, məclisi arəstə qıl, zahidə de:
Seyr elə gəl bu cəlalı, burax o minbərini.

* * *

Hüsnünün tərifini hər yerə şair aparır,
Gəl səfər töhfəsini alma əlindən sən onun.

* * *

Ləbinin söhbətini Hafiz alıbdır qələmə,
Sözlərindən hələ də abi-həyat yağmadadır.

* * *

Gecənin bir yarısı könlünə gün düşsə sənin,
Üzümün gül qızını cam ilə meydanə gətir.

* * *

Aqibət mənzilimiz xamuş olanlar çölüdür,
Fələkin gümbəzinə indi haray salmalıyıq.

* * *

Bir nəfər dost ki, onun olmaya heç nöqsanı,
Badədir indi fəqət, bir də qəzəl divanı.



* * *

Ayrılım əhli-riyadən, deyirəm, badə ilə,
Yeni bir qəlbi təmiz dost tapım dünyadə.

* * *

Şam kimi köynəyimin baxma qızıl rənginə sən,
Gör bu köynəkdə nə odlarda yanar canü tənim.

* * *

Şahlıq istərdi könül, mən sənə bir qul oldum,
Səltənət fikri ilə xidmətə məqbul oldum.

* * *

Bədənin paltar içində meyə bənzər şüşədə,
Ürəyin bir qara daşdır gümüşü ağ sinədə.

* * *

Eşq dürdanə, dəniz meykədə, mən qəvvasəm,
Cummuşam burda, görək bir də hayandan çıxaram.

* * *

İstərəm qaşlarını məktəbimə taq eləyəm,
Eşqinin dərsini orda oxuyam Məcnun tək.

* * *

Zahid ol sən, dedilər, tərk elə meyxanələri,
Mən dedim: qoy soruşum cam ilə cananımdan.

* * *

Kainat səndən alır, ey günəşim, burda həyat,
Gəl qızıl kölgəni məndən də kənar eyləmə sən.

* * *

Maceramız başa çatmır o nigar ilə mənim,
Hər nəyin əvvəli yoxdursa sonu olmayacaq.

* * *

Vermərəm mən yolunun torpağını dildarın
Zahidin hurisinə, qılmanına, cənnətinə!

* * *

Döndü Şiraz yenə ləli-ləbin mədəninə,
Çıxdı var-yoxdan əcəb burda bütün sərraflar.

* * *

İstərəm parçalayam mən bu riya paltarını,
Ruh üçün söhbəti nacinsin əzabdır əbədi.

* * *

Sənsiz, ey sərvi-rəvan, gülşəni mən neyləyirəm?!
Zülfün olmazsa əgər, sünbülü mən neyləyirəm?!

* * *

Məni görməzdi ayıq bircə nəfər dünyadə,
Yuxuda görsə idim məst xumar gözlərini.

* * *

Çəkdiyim qəm oxu yainki yanar nalə olub,
Nə deyim dərdli könüldən ki, nələr çəkməmişəm?

* * *

Ləbinin tarifini söyləmərəm əğyarə,
Cahilə incə sözü yaxşı deyil nəql eləmək.



* * *

Ayna ardında məni saxladılar tuti kimi,
Hər nə öyrətdilər əvvəldə onu söyləyirəm.

* * *

Heç bilirsən məni dövran niyə avarə salıb? –
İstəmir çünki səninlə oturub söhbət edəm.

* * *

Badə nuş et ki, onun heç kimə yoxdur zərəri,
Zöhd-təzvir eləmə, dərdü bəladır hamıya.

* * *

Zülfü tordur o gülün, xalı şirin bir danə,
O tora danə ümidilə könül bənd olmuş.

* * *

Bas məni bağrına bir cəng kimi kamımı ver,
Ya ki ney tək, dodağından mənə ruh bəxşiş elə.

* * *

Novbahar gördü ki, dövran necə odlar eləyir.
Ağladım yasəmənin, sünbülün əhvalı üçün.

* * *

Yuxarı başda oturdub məni dildar bu gün, –
Siz görün ki, necə bir məclisə sədr eylədilər!

* * *

Camə saqi bu əl ilə tökə meynabi əgər,
Məst-mədhuş olacaq ömrü boyu ariflər.

* * *

Günəşin vəsfini hardan biləcəkdir yarasa? –
Gözlülər dik baxa bilmir o nigarın üzünə.

* * *

Bu qədər şəhdü şəkər ki, qələmimdən tökülür,
Səbrimin əcrinə bəxş eyləyib o Şax Nəbat.

* * *

Neçə yüz xırman ilə çıxmayırıq biz yoldan,
Aldadıblar burada Adəmi bir danə ilə?

* * *

Taladı könlümü zülfün üzünün nuru ilə,
Bu dilavər qara oğru gecə şam ilə gəzir?!

* * *

Sən təmiz qəlbin ilə kaminə çatdın, Hafiz,
Qəlbi pak insana mən canımı qurban edərəm.

* * *

Saralır hər bir ağac badi-xəzan zülmündən,
Sərvdir təkcə ki, möhkəm dayanıb gülşəndə.

* * *

Ey gözəllər şahı lütf eylə fəqir aşiqinə,
Çoxlu şah saldı yerə dövr-zaman təxtindən.

* * *

Səbr elə, qəmli könül, daim ümid ilə yaşa,
Bu gecə sübh olacaq, gül açacaq nurlu səhər.



* * *

Aşiqi-müflis əgər qəlbini vermiş yarə,
Neyləsin, başqa şeyə yoxdur onun imkanı.

* * *

Hansı sufi burada rind, nəzərbaz deyil?
Təkcə Hafiz arada eşq ilə bədnam oldu.

* * *

Nəyə lazım soruşaq bülbülün əhvalını biz,
O qəfəsdən ucalan nalədə hər söz vardır.

* * *

Hafizin könlü onun zülfünü seyr etmək üçün
Uçdu, döndü başına, düşdü, giriftar oldu.

* * *

Birinin ləli-ləbi, digərinin gül üzü var,
Yarıma qurban olum, hər ikisindən varıdır.

* * *

Könlünü göz yaşım ilə özümə yar elədim,
Daşı dünyadə fəqət sel aparar dəryayə.

* * *

Qızılın yoxsa əgər şükr elə, Hafiz, ki sənin
İnci sözlərlə dolu təb-xəzinən vardır.

* * *

Baxma mən mey küpü tək qəlbin oduyla coşuram,
Ağzıma möhr vurublar, ciyərim qanə dönüb.

* * *

Dinçilikdən deməyin ki, bu da bir xirqə geyib,
Bu qara pərdədə yüz eybi nihan eyləmişəm.

* * *

Bu əl ilə çala mütrüb əgər eşqin sazını,
Hafizin şeri bütün məclisi məst eyləyəcək.

* * *

Şirinin ləblərinə həsrət üzündən hələ də
Lalələr bəxş eləyir torpağı fərhadımızın.

* * *

Lalə bilmiş ki, vəfasız yaranıb dünyamız,
Qədəhi salmadı əldən nə qədər ki, sağ idi.

* * *

Ey xuraman yeriyən kəklik, özündən ayıq ol,
Sən inanma ki, pişik tövbə qılıb, abid olub!

* * *

Gəldi meyxanəyə Hafiz də çıxıb məsciddən,
Tərk edib zöhdü riyanı, ayılıbdır deyəsən?

* * *

Gəl ki, bir ah ilə mən dərdimi izhar eləyim,
Bu qədər az sözümün gör nə qədər hikməti var!

* * *

Dəli-divanə könül, zənciri tərk eyləmədi,
Ver, basım bağrıma bir yerdə onu zülfün ilə.



* * *

Ürəyin qan olacaq, Hafiz əgər şərh eləsə,
Qocalıq halətini, gəncliyin əfsanəsini.

* * *

Mərdlik öyrən, kərəm et, bəxşiş elə dünyadə,
Yoxsa heyvan da mey içmir, niyə insan olmur!

* * *

Açmasa kimsə təbibə əgər öz dərdlərini,
Gün keçər, il dolanar, dərdinə dərman olmaz.

* * *

Mən meyi tərk eləyim? Yox! Bu necə söhbətdir?!
Bu kimi işləri dərk etməyə ağlım vardır.

* * *

Bir saat dostum ilə ömr eləsəm aləmdə,
Bu saat hər iki dünyayə bərabər kimidir!

* * *

Bir gecə Leyliyə Məcnun dedi: Ey nazlı nigar,
Sənə aşiq tapılar, lakin, o, Məcnun olmaz.

* * *

Naz edirdi günəşə, ayə gözəllər burda,
Səni gördükdə utandı, hamı örtdü üzünü.

* * *

Heç bilirsən nə üçün könlümü çox isteyirəm? –
Bir nişandır mənə hindu xalının nəqşindən!

* * *

Dil açıbdır hamı ki, aşiqəm o dildarə,
Dili ilə ürəyi bir olana qurban olum.

* * *

Səhər eşqilə keçir sən gecəni Hafiz tək,
Ta üfüqdə açıla qırmızı şadlıq çiçəyin.

* * *

Tövbənin payəsi bərklikdə qara daş kimidir,
Vuralım, sındıralım biz şüşə cam ilə onu!

* * *

Qol-qanad tapsan əgər çox havalanma, ayıq ol,
Ox uçar göydə, başı üstə düşər sonra yerə.

* * *

Ağlamaqdan diləyim təkcə budur aləmdə,
İstərəm ta ki, məhəbbət gülü açsın ürəyin.

* * *

Qulağımda daha yer yox ki, nəsihət eşidəm,
Doldurubdur onu çəng ilə rübab avazi.

* * *

Yaxşıyam, ya ki pisəm, sən özünün fikrini çək,
Biçər axırda, məsəldir, hərə öz əkdiyini.

* * *

Bağı-Firdovs gözəldir, nə olar, qoy olsun,
Hələlik qədrini bil sən bu gözəl gülzarın.



* * *

İstəsən eşqə könül verməyə, təxir eləmə,
İstixarə nəyə lazım belə bir xeyir işdə?

* * *

Baxıram hər kimə dərdinlə giriftar olmuş,
Bir könül yox ki, onu yıxmaya eşqin ələmi.

* * *

Demə, Hafiz, ki xəzan vurdu niyə gülzarı,
Harda gül varsa, yəqin, orda tikan olmalıdır.

* * *

Mey də, mütrüb də, qızıl gül də gülür gülşəndə,
Eyş yoxdur arada, çünki o yar burda deyil.

* * *

Qönçə ağzın, gözəlim, abi-həyat çeşməsidir,
Ləbin altında fəqət çahi-zənəxdanın var.

* * *

Din nədir ki, alasan, canımı gəl al, gözəlim!
Sən ki məstanə gəlibsən bu gecə xəlvətimə!

* * *

Əlini özgə əlində görüb o dildarın,
Qurudum qəmlər əlindən mən ayaq üstündə.

* * *

Az nağıl aç bizə sən, mədrəsədən, məsciddən, –
Hafizin xatirinə yar ilə meyxanə düşüb.

* * *

Həsrətilə ləbinin mən gedirəm dünyadən,
Torpağım daim olar qırmızı güllər vətəni.

* * *

Rind, aşiq, mey içən, rəngü riyadən pəhriz,
Seyrə dal gör ki, necə incə sənət sahibiyəm.

* * *

Şölə tək esdim önündə o gözəl qamətinin,
Söndü zülmətdə ömür şam kimi çöhrəndən uzaq.

* * *

Vətəni bir dəfə də mən hələ tərk etməmişəm,
Səni görmək üçün ancaq düşərəm qürbətə də.

* * *

Mənə bir busə əta etsən o gül ləblərdən,
Dönəcək gülşənə ömrüm bu xəzan əyyamı.

* * *

Səni öz qamətinə and verirəm, öldükdə –
Ey gözəl sərv, məni kölgən ilə yad edəsən.

* * *

Quluyam öylə kəlamın ki, cana od vursun!
Nəyə lazım su tökə buz kimi söz gözlərinə?

* * *

Od vurub odlamısan könlümüzü nazın ilə,
Uçuruq tüstü kimi göydə havan ilə sənin!



* * *

Vəsl pərvanəsi göndər mənə hicran gecəsi,
Yanacaq ahim ilə yoxsa cahan şəm kimi.

* * *

Hər quşun həddi deyil eşqi tərənnüm eləyə,
Bu qəzəl bülbülünün gəl gülü ol gülşəndə.

* * *

Bağlayıb könlümü bir qönçə kimi çərxi-fələk,
Güldür öz lütfün ilə sən onu yaz yelləritək.

* * *

Qulunam, yar, sənin, istəsən azad edəsən,
Aparıb meykədəyə, sat oraya, xadim olum.

* * *

İncəlik, hüsn, xudaya, nə desən var onda,
Çatmayan təkcə vəfadır, onu da mərhəmət et.

* * *

Arxada çoxlu qalan var, qayıdıb yardım elə,
Nə sürürsən atını dördnala, ey yar, dayan!

* * *

Hafizin şeri bütün elmü ədəb məktəbidir,
Afərin sənətinə, sözlərinin qüdrətinə!

* * *

Hüsnünün gəzmə dalınca, tapa bilməzsən onu,
Yapışıb əl-ələ bir yerdə cavanlıqla gedib.

* * *

Eşqi şərh eyləmə, çünki ürəyin atəşini
Hansı söz gəlsə dilə şərhi-bəyan eyləyəcək.

* * *

Ya mənim bəxtim azıb mehrü məhəbbət yolunu,
Ya ki dildar bu yoldan neçə vaxtdır keçməz.

* * *

Gözəlim, çünki sən öz aşiqinə göz yumdun,
Üzünə açmadı dövran daha şadlıq qapısı.

* * *

Razı idim can ala, bəlkə mənə busə verə,
Nə bunu aldı nigarım, nə onu verdi mənə.

* * *

Bağlanıb meykədələr, qoyma ki, yarəb, açıla
Burda min hiylə ilə zöhdü riyanın qapısı.

* * *

Hafiza, könlünü sən alma yarın zülfündən,
Çünki divanə müdam zəncirə bağlanmalıdır.

* * *

Eşqə düşdüm ki, tapam məqsədimin gövhərini,
Bu dənizdə, nə bilim, bir belə tufan var imiş!

* * *

Özünü, ey məlikülhac, dayan, öymə belə,
Ev görübsən sən əgər, evdə mən Allah görürəm.



* * *

Deməyin Hafizə, dostlar, niyə surətbaz olub,
Könlümün allahıdır hüsn bu dünyadə mənim.

* * *

Keçdi vəslin bu işıqlarla dolu şən gecəsi,
Firqətin də qara əyyamı bu cür qalmayacaq!

* * *

Fərqi yoxdur qəfəsindən açıb azad edəsən,
Ordan uçsam qonaram mən qapının torpağına.

* * *

Öpsən, öp yar ləbini, bir də meyin şişəsini,
Hafiza, zahid əlindən uzaq ol, murdardır!

* * *

Quş kimi məskən edib zülfünü məftun ürəyim,
Qoyma ki, öz yuvasından o didərgin düşsün.

* * *

Durma, saqi, səhər oldu yenə, meynab gətir!
Fələkin dövrü dayanmır, bizə durmaq yaramaz.

* * *

Novbahardır, çalışıb gül kimi xoşhal olalım!
Min dəfə gül açacaq biz qara torpaqda ikən.

* * *

Demirəm, indi nə iç, ya ki otur kimlər ilə,
Gözlərin bağlı deyil, öz-özünün qeydinə qal!..

* * *

Gözünü tikmə böyüklər yerinə boş-boşuna,
Çalış əvvəlcə böyüklərdə nə var öyrən sən!

* * *

Xar ilə həmdəm olubsan, çox əcəbdir, ey gül!
Deyəsən vaxta görə məsləhətin bunda imiş...

* * *

Sufiyanə sənə mən bir dənə söz söyləyirəm:
Gözünün nuri kimi sülhü qoru dünyadə!

* * *

Nə olar söyləsə nərgiz, gözünə bənzəri var,
Gözü nursuz olanın kim düşəcəkdir dalına.

* * *

İç qədəhdən günəşi, uç fərəhin zirvəsinə,
Çünki tale sənə bu dövrdə yar olmayacaq.

* * *

Demə şadlıqla qızarmış üzü bir cam kimi,
Könlümün qanı bu cür əks olunub surətdə.



* * *

Mərifət gövhəri öyrən ki, sənindir əbədi,
Özgənindir nə qədər olsa qızıl dünyadə.

* * *

Qədrini bil iki yol üstə gözəl dildarın,
Bir də bu mənzilə düşməz yolumuz dünyadə.

* * *

Leyliyə çatmaq üçün yolda ölüm qorxusu var,
Məcnun olmaq gərək əvvəl bu yola düşmək üçün.

* * *

Qara hicran gecəsi canımı yığmış boğaza,
Vaxtdır rəhmə gəlib, ay kimi taban olasan.

* * *

Amirin oğlu kimi çoxları Məcnun olacaq,
Çıxsa dünya çadırından yeni bir Leyli əgər.

* * *

Zahida, bir dəfə göz vursa sənə dilbərimiz,
Meylə məşuq olacaq Tanrıdan ancaq tələbin.

* * *

Ey çibin, gəlmə ki, Simürğ dayanmış burada,
Bizə zəhmət, özünə vermə xəcalət, bəsdir!

* * *

Canımı yarə fəda eyləməsəm,
Nəyə lazım olacaqdır o mənə?

* * *

Zər ilə səni bəzərlər, zor ilə səni sevərlər,
Nə zərim, nə də zorum var, nəzər et, sevimli dilbər!

* * *

Mən əgərçi meypərəstəm, daha vermə mey ki, məstəm,
Ürəyi aparma məndən ki, yeni ürək yoxumdur.

* * *

Hərə bir bəhanə ilə dolanıb keçir qapından,
Səni görməyin ümidi qoyub aləmi işindən.

* * *

Əmmamə qoymağından bir ayrı niyyətin var:
Döndərmək istəyirsən xalqı bu haqq yolundan.

* * *

Sən sehrə bax ki, mən də bir cığ qara qələmlə
Şəhd ilə, şəkkər ilə doldurmuşam cahanı.

* * *

Düşmən yalan deyirsə, Hafiz, qulaq asılmaz,
Haqq söyləyirsə, onda haqqı qəbul edək biz.



* * *

Yox bir kəsə ziyanı gizlin olan günahın,
Üzdə riya üzündən əsla ibadət etmə.

* * *

Meyxanəni əzəldən Hafiz məkan edibdir
Əlbəttə, şir həmişə cəngəldə məskən eylər.

* * *

Əvvəldə söylədik ki, rindik, nəzərbazıq biz,
Dönməz kişi sözündən mərdanədirsə hərgah.

* * *

Ariflərin yanında dəm vurma çox özündən,
Ya söz danış söz olsun, yainki sakit əyləş.

* * *

Şerimdən ayrı əldə yox ayrı bir mətaım
Əfsus! Onun da olmuş indi kasad bazarı.

* * *

Əyri qaşından əsla bir mərhəmət görünməz,
Kəc bir xəyalla ömrüm keçdi sənin qapında.

* * *

Məcnun kimi dolandım eşq aləmində xeyli,
Heç bir nişanə yoxdur dildarın izlərindən!

* * *

Aşiqləri yolundan göylərdəki hilal tək,
Saxlar qaşın həmişə, sonra itər telində.

* * *

Bağban əgərçi, ey gül, bəslər səni çəməndə,
Qafil oturma bir gün hərrac edər bazarda.

* * *

Min nüktə var bu sözdə tükdən də incədir çox,
Hər saç qoyan, deməzlər, dönmüş qələndər olmuş.

* * *

Səy etmədən həyatda çatmaz mərama insan,
Muzd almaq istəyirsən ustada hörmət eylə.

* * *

Məsciddə qilü qaldan könlüm tutuldu, eyvah!
Saqi, dayanma, dindir sakit baxan rübabı!

* * *

Hafiz, bəzənmək istər təbim mənim gəlin tək,
Bir ah gəlir ürəkdən, qarşımda ayna yoxdur!

* * *

Nəqd etmişəm behişti meyxanə guşəsində,
Zahid, sənin nisyənə, əfv et, inanmıram mən!



* * *

Hərçənd ki, mən qocaldım, düşdüm ayaqdan, ey dost!
Hər vaxt səni düşündüm, əl verdi növcavanlıq.

* * *

İllər qocaltmayıbdır, dildar düşmən oldu,
Əydi məni kədər, qəm, döndərdi bir kəmanə.

* * *

Bundan böyük ibadət yoxdur ki, zahidanə
Minbərdə işvə ilə aldatmıram bu xalqı.

* * *

Sən badə içmə, Hafiz, ömründə möhtəsiblə
Qəlbin sınar, inan ki, peymanə tək əlində.

* * *

Şahlıq tacında daim vardır ki, can bəlası,
Qiymətlidir o, ancaq dəyməz bu iztirabə.

* * *

Əl çəkmərəm tələbdən, mən kamə yetməyincə,
Ya əl çatar nigarə, ya can gedər əlimdən.

* * *

Əğyarı qov könüldən, dildar üçün yer eylə,
Əhrimən ilə huri bir yerdə məskən etməz.

***

Yar olmasa yanında gülzar xoş görünməz,
Mey olmasa əlində dildar xoş görünməz.

***

Tazə hilal ikən sən barmaqla göstərərdik,
Artıq bədirlənibsən, qoy bir baxaq doyunca.

***

Meyxanənin havası silmiş qəmi ürəkdən,
Hər kim könül şən eylər qəm görməsin həyatda!

***

Qəmlənmə sən həyatda əğyar tənəsindən,
Bir söz deyər o, birdən xeyrin odur görərsən.

***

Sünbül-süsən açılmış, dünya dönüb behiştə,
Əfsus gülşənimdən ömrüm keçir səfasız.

***

Həşrin o dəhşətindən vaiz ki nəql edirdi,
Bir müxtəsər nağıldır hicran hekayətindən.

***

Hafiz ki, böylə olmuş dilbərlərin əsiri
Xarəzmi ya Xocəndi etsin gərək o, məskən!



***

Sən qəlbləri apardın zülfünlə dəstə-dəstə,
Əlbəttə, bu qoşunla dünyanı fəth edərsən.

***

Pərgar kimi bu könlüm yaxşı-yaman dalınca
Hərlənsə də cahanı, möhkəm durub yerində.

***

Yalvarmağın əbəsdir, artıq bağışlanıbsan,
Meyxanə tək behiştin, huri kimi yarın var.

***

Gəl yaxşı ol bizimlə at pisliyi ürəkdən,
Pis olma yaxşılarla, pisdir bu, yaxşı bil sən.

***

Candır bizə həyatda dostun şirin kəlamı,
Qurban olr bu canım dostdan gələn kəlamə!

***

Səy eylə, bir xəbər tut, ey bixəbər, özündən,
Yol görməyən həyatda rəhbərliyi bacarmaz!

***

Meyxanədə söz açma əsla kəramətindən,
Hər bir sözün, düşün ki, əhli, məqamı vardır.

***

Gülşəndəki çiçəklər qalmaz həmişə tazə,
Acizləri unutma qüdrətli çağlarında.

***

Eşq aləmində birdir şahlar ilə gədalər,
Ey hüsn padişahi, bizdən uzaqda durma.

***

Hind ölkəsində tuti siyrab olar şəkərdən,
Farsdan bu qəndli şeri Bənqaləyə aparsan.

***

Söylə təbibə yoxdur mən xəstənin əlacı,
Dost olmayanda dilxor, dost ilə dilxoşam mən.

***

Eşq aləmində rədd et kibri, qüruru, ey dost!
Ətlas balış yox isə sən kərpic üstə qoy baş.

***

Qıvrım telin bu qəlbə min bir düyün vurubdur,
Mütləq olar məzarım şux qönçələr diyarı.

***

Hər vaxt şərab içəndə səp torpağa bir az da,
Yox qorxusu günahın bir fayda versə xalqa.



***

Bir torpağam mən indi sən keçdiyin o yolda
Qorxum budur ki, ey dost, yellər aparsın ordan.

***

Bir an sənin qapından ayrılmayır xəyalım,
Qürbət çəkən qəribin qəlbi vətəndə oynar.

***

Həmdərsini taparkən poz sözləri dilindən,
Öyrənməmiş bir aşiq eşq elmini kitabdan.

***

Pislərlə yoldaş olma tale kimi həmişə,
Qoy yaxşılar səninlə olsun həmişə yoldaş.

***

Eyş et çalış həmişə ay üzlü dilbərinlə,
Ancaq ki Hafizin də şerin ürəkdə saxla.

***

Hafiz, sənin şəkərli şerinlə rəqs edirlər,
Səmərqənd türklərilə, kəşmirli duzlu qızlar.

***

Hafiz, bizim məqamda türkcə, ərəbcə birdir,
Hər dildə istəyirsən, öz eşqini bəyan et.

***

Şahlıq əgər diləsən göstər əməldə, kimsən,
Yoxsa demə babamdır Cəmşid ilə Firidun.

***

Cənnət sənin evində bir xırdaca bucaqdır,
Abi-həyat ləbindən bir qətrədir mənimçin.

***

Apardı könlümü zülfün o xəttü xalın ilə,
Üç oğru ilə nə etsin bu çarəsiz aşiq!

***

Dedim ki, mən qocaya faydası nədir ləbinin?
Dedi ki, busə verib mən səni cavan edərəm!

***

Baxanda sidq, kəmal axtarın, deyil nöqsan,
Eyibli, böylə məsəl var ki, tez tapar eybi.

***

Səadətin açarı xalq üçün şirin dildir,
Bu sözdə bircə belə şəkk-şübhə eyləməyin.

***

Dedim, bu halə səni pis müsahibin salmış,
Dedi ki, bəxtim ilə bir doğulmuşam anadan.



***

Birinci tapşırığı pirimin bu olmuşdur
Ki, nanəciblər ilə heç zaman rəfiq olma!

***

Həmişə dost sözünü dosta eylərəm izhar
Ki, aşina sözünü aşina nihan saxlar.

***

Behiştə, huriyə uymuş əcəb yazıq zahid,
Behişt meykədə olmuş, mələk də saqi bizə!

***

Nə istəsən elə, ancaq toxunma özgəsinə
Ki, bundan ayrı günah yox bizim təriqətdə.

***

Atıb bu məscidi, dostlar, gedək o meykədəyə,
Yalançılar sözünü dinlədik, kifayətdir!

***

Uçar həyatda bütün qəsrlər, imarətlər,
Məhəbbətin sarayı heç zaman xərab olmaz.

***

Qədəhlə qarşıla, saqi, günəş gələndə müdam!
Xeyirlə ta ki açılsın onun ömür səhəri.

* * *

Apardı qəmzə ilə könlümü xumar gözlər,
Sənin dalınca, əzizim, sürünməyim, nə edim!

* * *

Qısa tikibsə də zahid əbasının qolunu,
Onun-bunun malına öz əli uzun yaranıb.

* * *

Nə cür verim bu könül dürrünü gözəllərə mən
Ki, mehrinin möhürü bağlayıb xəzinəmizi?!.

* * *

Zəmanə hər nə verərsə, tutub alar bir-bir,
Səfildən istəmə heç nə ki, hər şeyi puçdur.

* * *

Çəməndə hər çiçəyin bir behişt hekayəti var,
Neçin bu nəqdi sataq biz sabahkı nisyələrə?

* * *

Əgər zəmanə məni istəsəydi sərvər edə,
Sənin qapında, yəqin, qul edərdi əvvəldən.

* * *

Şikayət etmə, ədəbdən kənar olur, hərgah
Rahatlıq axtarasan zəhmət olmayan yerdə.



* * *

Səhər küləklərinə çox şikayətim vardır,
Nə eyləmək ki, sabah olmayır bu dərdli gecə.

* * *

Baharda tövbəm üçün badədən xəcil oldum,
Xəcalət olmaya heç kəs, görüm ki, pis işdən!

* * *

Bizim ümid əlimiz bağlanıb o saçlarına,
Qəribədir ki, hələ çatmayıb bir an da ona.

* * *

Vəfa edib xoş olaq qəm, cəfa içində müdam,
Bizim təriqət ara incimək günah sayılır.

* * *

Baxanda öz biləyimdən xoşum gəlir, çünki
Əlindən heç kəsə pislik həyatda gəlməz onun.

* * *

Fələk kimi əyilib qamətim, dilim gəlməz,
Deyəm ki, tərk edirəm dilbərin hilal qaşını!

* * *

Canın bahasına olsa visalını alaram,
Necə deyilsə alar cins mətaı müştərisi.

***

Nə qazıyəm, nə müdərris, nə möhtəsib, nə fəqih,
Mənə nə var ki, deyəm: badə içməyin, xalqa.

***

Sənin qəmər üzünü zülf içində gördükdə,
İşıqlanırdı gecəm, ey nigar, gündüz tək.

***

Visal havası ilə uçmağa yox imkanım,
Töküldü balü pərim ayrılıq diyarında.

***

Ləbinlə çarə elə qəm dolu bu qəlbimə sən
Ki, bu "müfərrih yaqut" səndədir ancaq.

***

Məni piyalə ilə dəfn edin ki, həşrə kimi
Mey ilə ta özümü saxlayım o məhbəsdə.

***

Nə eyləyim bu qəriblikdə? Düz deyir könlüm;
Gedim diyarıma mən, orda şəhriyarım olum.

***

Qərib ki, yer tanımaz, şübhə yox, azar yolda,
Yenə o zülfünün ətrilə düşmüşəm yola mən.



***

Gəlib bu canıma eşqin süd ilə əvvəldə,
Əgər gedərsə, əzizim, gedər bu canım ilə.

***

Riya halal sayıldı, mey isə oldu haram, –
Bu millətin işinə, məzhəbə, təriqətə bax!

***

Köpük kimi ataram börkümü, inan ki, göyə,
Camın içində əgər əks ola nigarın üzü.

***

Qəzəldə Hafizə derlər şirin söz ustadı
O gah da bir danışan yarının dodağı olub.

***

Qızıl badəyə mərhəba, afərin!
Ki, sildi üzümdən solan rəngimi.

## TARİXİ VƏ ƏFSANƏVİ ADLARIN İZAHI

Adəm – Dini əfsanəyə görə Adəm ilk yaradılmış insan, bütün insanların ulu babası və peyğəmbərlərin birincisidir. Guya o, cənnətdə yaradılmış, orada Həvva ilə qırx gün yaşamış, sonra Allahın əmrini pozaraq buğda yediyi üçün cənnətdən qovulub yerə sürgün edilmişdir.

Asəf – Dinlər tarixinə görə Süleyman peyğəmbər həm peyğəmbər, həm də padşah olmuş, Asəf bin Bərxiya onun birinci veziri imiş; çox ağıllı, tədbirkar, dövləti idarə etməkdə mahir bir adam imiş. Musiqişünaslıqda və nəğmələr yaratmaqda da çox pərgar imiş. Sonralar hər dövrün belə ağıllı və alim adamlarına Asəfi-zəmanə yaxud Asəfi-dövran ləqəbi verilmişdir.

Bəhram – Bu adla İranın qədim hökmdarları arasında altı şah olmuşdur. Hafiz burada müəyyən bir Bəhramı deyil, ümumiyyətlə, Bəhramları (şahları və qəhrəmanları) nəzərdə tutur.

Büzürcmehr (və ya Buzərcmehr) – Sasani şahlarından Nuşirəvanın veziri olmuş; əqli ilə məşhur olmaqla bərabər Hindistandan bir sıra qiymətli kitablar əldə edərək, Pəhləvi (orta fars) dilinə tərcümə etdirmişdir. Rəvayətə görə, nərd oyununu da icad edən Büzürcmehr imiş. Miladın 580-ci illərində ölmüşdür.

Cəm – Cəmşid sözünə bax.

Cəmşid – İranda hökmranlıq etmiş Pişdadiyan sülaləsinin dördüncü və böyük padşahlarından sayılır. Əfsanəvi bir şəxsiyyətdir. Rəvayətə görə şərabı Cəmşid icad etmişdir. Onun qədəhi şairlərin əsərlərində Cami-Cəm adı ilə məşhurdur. Novruz bayramı da guya Cəmşiddən qalmışdır.

Dara – İranın qədim padşahlarından Kəyan sülaləsinin son hökmdarı olmuş; eradan əvvəl 342-ci ildən 330-cu ilə qədər hökmranlıq etmişdir. İskəndər Zülqərneyn İrana hücum etdiyi zaman Dara öldürülmüşdür.

Əbu-İshaq – Şeyx Əbu İshaq İncu Hafiz dövrünün şahlarından olmuşdur. Müzəffərilər sülaləsinin banisi Əmir Mübarizəddin Məhəmməd tərəfindən 1356-cı ildə öldürülmüşdür. Hafiz Şirazi Əbu İshaqın alimliyinə və şəxsi müsbət keyfiyyətlərinə görə ona çox hörmət etmiş və ölümünə mərsiyə yazmışdır.



Əfrasiyab – Əfsanəvi bir şəxsiyyətdir. İranlıların qədim tarixinə görə Əfrasiyab Firidunun üç oğlundan birisi olan Turun nəvəsidir. Həmin Turun adı ilə bağlı olan Turanın ən böyük hökmdarlarından sayılır. Bir zaman İranı zəbt edərək on iki il orada hakimiyyət sürmüşdür. Sonradan iranlıların üsyanı nəticəsində bu ölkədən çıxarılmışdır. Firdovsinin "Şahnamə"sində Keykavusun oğlu Səyavuş İrandan Turana qaçaraq Əfrasiyabın yanına getmişdir. Əfrasiyab öz qızını Səyavuşa vermiş və ondan Keyxosrov dünyaya gəlmişdir, nəhayət Əfrasiyab Keyxosrovun əlində ölmüşdür.

Əhrimən – Qədim iranlıların etiqadına görə Əhrimən şər və yamanlıq allahı imiş, guya qaranlıq və gecə onun hökmündə olubmuş. Əhrimən xeyir allahı olan Hörmüzd ilə həmişə ədavətdədir. Dünyada olan xeyir və şər bunlardan gəlirmiş. Guya bir gün Hörmüzd Əhrimənə qalib gəlib onu məhv edəcək, bununla da dünyadan şər qalxacaq və insanlar xoşbəxt yaşayacaqlar.

Ənuşirəvan (və ya Nuşirəvan) – İranın Sasanilər sülaləsinin iyirminci şahıdır. Ərəblər onu Kəsra, yunanilər Xosrov adlandırmışlar. Ənuşirəvan qırx səkkiz il hakimiyyət sürmüşdür. Atası Qubadın 531-ci ildə ölümündən sonra taxta çıxmış, Rum, Turan, Hindistan və başqa qonşu dövlətlərlə müharibələr etmiş, bir çox yerlər zəbt etmişdir. Tarixi rəvayətlərdə Ənuşirəvana "Böyük" və"Adil" ləqəbləri verilmişdir.

Əyaz (və ya Ayaz) – Sultan Mahmud Qəznəvinin qulamlarından və ən yaxın dostlarından olmuş, əqli və sədaqətilə sultanın dərin məhəbbətini qazanmışdır. Şairlər Mahmudla Əyazın dostluğu haqqında şeirlər yazmışlar.

Fərhad – "Xosrov və Şirin" hekayəsinin qəhrəmanı Xosrov Pərvizlə yanaşı Şirinin ikinci aşiqi. Şirinə çatmaq uçun Bisütun dağını yarmış. Şairlər tərəfindən eşqi uğrunda fövqəladə hünərlər göstərmiş olan məşhur aşiqlər kimi tərif olunur.

Firidun – İranın qədim əfsanəvi padşahlarındandır. Cəmşid Cəmin nəvəsidir. Pişdadiyan sülaləsinin (ərəb Zöhhak sayılmasa) beşinci hökmdarı sayılır. Tarixi bir şəxsiyyətdən artıq mifik bir şəxsdir.

Gavə – İranın qədim tarixində əfsanəvi bir dəmirçidir. Gaveyi-Ahəngər, yəni dəmirçi Gavə adı ilə də məşhurdur. İranı istila edən ərəb Zöhhakın əleyhinə üsyan etmiş, onu taxtdan salaraq, Cəmşidin nəvəsi olan Firidunu onun yerinə oturtmuşdur. Gaviyani ələm – Gavə-

nin bayrağı demekdir ki, qurtuluş rəmzi kimi məşhur olub, iranlılar tərəfindən müqəddəs sayılır.

Güləndam – Məhəmməd Güləndam Hafiz Şirazi ilə oturub durmuş bir adamdır. Aralarında qarşılıqlı hörmət var imiş. Bunun dediyinə görə Hafiz əsərlərini toplayıb divan şəklinə onun üçün salmamış ki, Quranın təfsiri ilə və elm ilə çox məşğul olmuşdur. Quranla çox məşğul olmağı Hafiz özünə fəxr bilmişdir.

Hatəm – ibn Abdulla ibn Səd Tai. Ən çox Hatəmi Tai adı ilə məşhurdur. VI-VII əsrlərdə ərəblərin qəbilə başçılarından və şairlərindən olmuşdur. Dövrünün ən səxavətli adamı imiş və səxavəti ilə də şöhrət tapmışdır.

Xosrov (Xosrov Pərviz) – İranın Sasanilər sülaləsinin iyirmi ikinci hökmdarı olmuşdur. Hörmüzün oğlu və məşhur Nuşirəvan Adilin nəvəsidir. Otuz səkkiz il padşahlıq etmişdir."Xosrov və Şirin" poemasında Nizami bunun həyatını təsvir edir. 626-cı ildə taxtdan salınmış, yerini oğlu Şiruyə tutmuşdur.

İsa – Dini rəvayətə görə xristianların peyğəmbəridir. Guya Cəbrail Allahın ruhunu Məryəmin burnuna üfləməklə Məryəm hamilə olmuş və İsanı doğmuşdur, buna görə İsaya Ruhullah da deyirlər.

İskəndər – Buna İskəndər Zülqərneyn, İskəndər Rumi, İskəndər Kəbir və Makedoniyalı İskəndər də deyirlər. (Eradan qabaq 356-322). Dünyanın ən böyük sərkərdələrindən olmuş. İndiki Yunanıstanı, Suriyanı, Bizansı, İranı, Hindistanı tutub özünə tabe etmişdir. Hafizin dediyi: İskəndərin aynası – Ərəstunun ixtira etdiyi bir aynadır ki, İskəndəriyyə şəhərində bir qələ üstündə taxılmışdı, bunun vasitəsilə düşməni yüz mildən artıq məsafədən görmək mümkün olardı (Mil - kilometrə yaxın yol ölçüsüdür).

Kavus - Keykavus və Kavus Key şəklində də deyilir. Qədim İranın Keylər sülaləsinin ikinci padşahı sayılır. Firdovsinin "Şahnamə"sinə görə Səyavuşun atası, həm də Keyxosrovun atasıdır.

Key – Qədim İran şahlarının ikinci sülaləsinin ümumi ləqəbidir. Keylər, Kəyan, Keyaniyan da deyilir. Sözün lüğəti mənası böyük deməkdir: Keyqubad, Keykavus, Keyxosrov və b.

Kənan – Qədim Finikiya ilə Fələstin və Suriyanın bir hissəsindən ibarət bir ölkə olmuşdur. Guya Nuhun nəvəsi Kənanın adı ilə adlandırılmışdır. Dinlər tarixində və ədəbiyyatda ən çox Yəqub peyğəmbərin vətəni sayılır.



Kəsra – İranın Sasanilər sülaləsində Nuşirəvana və ondan sonra gələn İran şahlarına verilən ümumi ləqəbidir, rus şahlarına çar deyilən kimi.

Qarun – Mifik rəvayətlərə görə mal-dövlətinin çoxluğu, eyni zamanda xəsis olması ilə məşhur bir adam imiş. Yəhudilərin peyğəmbəri Musanın müasiri və bir rəvayətə görə düşməni imiş. Əvvəlləri yoxsul olmuş, sonra Musanın köməyi ilə guya kimyanı öyrənmiş və bu vasitə ilə hədsiz sərvət əldə etmişdir, lakin Musanın təklif etdiyi hissəni xalqa vermək istəmədiyindən onun bəd duasına tutulmuş, dövləti ilə birlikdə diri-diri yerə batmışdır.

Qubad – Məşhur Nuşirəvan Adilin atasıdır. Sasanilər sülaləsinin 19-cu padşahı olmuş. 36 il hökmranlıq edib, 531-ci ildə ölmüş, oğlu Nuşirəvan yerini tutmuşdur.

Loğman – İslamiyyətdən min ildən daha çox əvvəl yaşamış imiş. Quranda da bunun adı çəkilmişdir. Bunu peyğəmbərlərdən biri sayanlar da vardır, hər halda Loğman şəxsiyyəti və milliyyəti, hətta vücudunun zaman və məkanı belə məlum olmayan əfsanəvi bir filosof və həkim olmuşdur.

Mahmud – Sultan Mahmud Qəznəvi qəznəvilər sülaləsinin banisidir, 997-ci ildən 1030-cu ilə qədər hökmdarlıq etmişdir. Şərqi İranı, Türküstanı və Hindistanın çox hissəsini zəbt edib böyük bir dövlət yaratmış və böyük sərvət toplamışdır. Firdovsi "Şahnamə"sini onun tapşırığı ilə yazmışdır.

Məcnun Amirin oğlu – Muləvvəh (və ya Muaz) ibn Məzahim Amirinin oğlu; əsl adı Qeysdir. Səd adında bir kişinin qızı Leyliyə aşiq olub çöllərə düşdüyü üçün ona Məcnun (dəli) ləqəbini vermişlər. (Amir Ərəbistanda yer adıdır).

Mənsur – Mənsur Həllac adı ilə məşhurdur. Böyük sufilərdən biridir. İranın Fars vilayətinin Beyza şəhərindən olmuş. Şəriətin əleyhinə çıxışları üstündə 918-ci ildə Bağdadda edam edilmişdir. Rəvayətə görə dar ağacından asıldığı zaman burnundan axıb tökülən qanı ilə yerdə: "Ənəl-həq!" – mən həqqəm" sözləri yazılmışdır. Nəsimi haqqında olan kimi Mənsur Həllacın da faciəsini şairlər əsrlərlə şeirlərində xatırlatmışlar.

Məsiha – Məsih də deyirlər. İsanın ləqəbidir. İsa sözünə bax.

Musa – İmranın oğlu, yəhudilərin peyğəmbəri. Dini rəvayətlərə görə uzun illər Misir hökmdarı Firon ilə xalqının azadlığı uğrunda

mübarizələrdən sonra peyğəmbərliyə yetişmişdir. Musanın kitabı olan "Tövrat" yəhudilərin müqəddəs kitabı sayılır.

Pərviz – Xosrov sözünə bax.

Piran – Turan hökmdarı olmuş Əfrasiyabın qəhrəmanlarından biridir. Firdovsinin "Şahnamə"sində təsvir olunan İran ilə Turan müharibələrində Turan ordusunun baş komandanı olmuşdur. Qocalıqda öz yaşında olan İran qəhrəmanı Gudərz ilə mübarizədə öldürülmüşdür.

Səlm – İran əsatirində Pişdadiyan sülaləsinin beşinci padşahı Firidunun oğludur. Firidun ölümündən əvvəl məmləkətindən Fərat çayının qərb cəhətlərindəki yerləri Səlmə vermişdi. Beləliklə, Səlm sam xalqlarının ulu babası sayılır (Bu əsatirdə Nuhun oğlu Sam ilə Firidunun oğlu Səlm bir-birinə qarışdırılır).

Səyavuş – İran əsatirinə görə Keykavusun oğlu və Keyxosrovun atasıdır. Əfsanəvi pəhləvan Rüstəm Zal tərəfindən tərbiyə edilmiş, çox bacarıqlı bir pəhləvan olmuşdur. Südabənin böhtanına düşəndə İranı tərk edib Turana getmiş. Əfrasiyabın qızı Firəngizlə evlənmiş. Keyxosrov həmin Firəngizdən olmuşdur.

Siyamək – İran əsatirində birinci padşah sayılan Kəyumərsin oğludur. Nağıllarda div adlanan yarımvəhşi dağ adamları tərəfindən öldürülmüşdür.

Süleyman – yəhudilərin qədim peyğəmbərlərindəndir, eyni zamanda onların padşahı olmuş. Dini rəvayətə görə Süleyman heyvanların, quşların, balıqların dilini bilirmiş. Yel də onun ixtiyarında imiş. Süleymanın bir üzüyü də varmış ki, guya onun vasitəsilə bütün aləmə hökm edərmiş. Hafiz: "Üzük harda qaldı? Süleyman hanı?" dedikdə buna işarə edir.

Şirin – Xosrov Pərvizin və Fərhadın sevgilisi. Nizaminin "Xosrov və Şirin" poemasının qəhrəmanlarındandır.

Şiydə – Əfrasiyabın oğludur. Əsl adı Pəşəngdir. Çox parlaq gözəlliyə malik olduğu üçün atası onu günəş mənasında olan Şiyd və ya Şiydə adlandırmışdır. "Şahnamə"də bir neçə dəfə adı çəkilir.

Təhəmtən – Söz komandan mənasındadır, həm də qüvvətli, güclü və qəhrəman, nəhəng deməkdir. İran klassik ədəbiyyatında, xüsusən Firdovsinin "Şahnamə"sində məşhur Rüstəm Zalın ləqəblərindəndir.

Tur – İranın Pişdadiyan sülaləsinin beşinci padşahı Firidunun üç oğlundan biridir. Firidun ölümündən qabaq məmləkətindən Türküstan



tərəflərini Tura vermişdi. Beləliklə, Tur turanlıların və türklərin əfsanəvi ulu babası sayılır.

Tus – Qədim İranın qəhrəmanlarındandır. Rüstəm Zal, Gudərz və başqa qəhrəmanlarla birlikdə Turana və Əfrasiyaba qarşı uzun müddət müharibələrdə iştirak etmişdir. Tus haqqında "Şahnamə"də rəvayətlər vardır. Deyirlər ki, Xorasanın qədim şəhərlərindən, indi xaraba olan, Firdovsi Tusi, Nəsirəddin Tusi kimi böyük şəxsiyyətlərin vətəni olmuş və vaxtilə Cəmşid tərəfindən tikilmiş, sonra dağılmış Tus şəhərini həmin Tus ibn Nouzər yenidən təmir etmişdir.

Yəqub – İbrahim Xəlil peyğəmbərin nəvəsi, Yusifin atası, yəhudilərin Musadan əvvəlki peyğəmbərlərindəndir. Yəqubun on iki uşağı olub; hamısından çox kiçik oğlu Yusifi sevərdi. Yusifin qardaşları bunu görüb Yusifə ədavət bəsləyirlər və onu çölə aparıb bir quyuya salırlar, gəlib atalarına "Yusifi qurd yedi" deyirlər. Yaqub Yusif üçün ağlaya-ağlaya iki gözündən kor olur. Hafiz: "Yəqubun iki gözü həsrətdən ağardı – Misirdən Kənana (yəni Yusifin olduğu yerdən Yəqubun olduğu yerə) bir xəbər çatmır, dedikdə bunu nəzərdə tutur.

Yusif – Dinlər tarixində Yəqub peyğəmbərin başqa oğullarından çox sevdiyi kiçik oğludur. Yusif qardaşlarının paxıllıqlarına uğrayıb onların tərəfindən bir quyuya atılmış, sonra oradan xilas olub Kənandan Misrə aparılmış, Züleyxanın ərinə satılmış. Son dərəcə gözəl olduğu üçün Züleyxa ona aşiq olmuş. Yusif Züleyxanın təklifinə razı olmadığı üçün Züleyxa ona böhtan atmış və Yusifi zindana salmışlar. Yeddi il zindanda qalandan sonra Yusif bəraət qazanıb vəzir təyin edilmiş. Sonra Züleyxa dul qalıb zəlalətə düşmüş, Yusif alicənablıq göstərib onunla evlənmişdir. Dinlər tarixində və Yaxın və Orta Şərq ədəbiyyatlarında "Yusif və Züleyxa" hekayəsi məşhurdur.

Zal – Samın oğlu və əfsanəvi pəhləvan Rüstəmin atasıdır. Buna görə Rüstəmə – Rüstəm Zal deyirlər.

Zalın oğlu – məşhur pəhləvan Rüstəm, iranlıların ən məşhur əfsanəvi pəhləvanıdır. Şücaətləri Firdovsinin "Şahnamə"sində uzun-uzun təsvir edilmişdir.

Zərdüşt – Buna Zoroastr və Zaratuştra da deyirlər. Atəşpərəstlərin peyğəmbəri sayılır. İran nağıllarına görə İran dualistik dininin, yəni mazdəizmin banisidir. Bir para qədim İran alimləri Zərdüştü mifik bir şəxsiyyət sayırlar. Lakin əksəriyyət onu bir tarixi sima bilir. Onun dininin ehkamından ibarət olan "Avesta" və "Zend-Avesta"

ateşpərəstlərin müqəddəs kitabıdır. İskəndər İranı zəbt edərkən zərdüştiləri təqib etmiş, atəşkədələrini dağıtmışdır.

Züleyxa – Qədim Misir hökmdarının arvadı olmuş. Yusifin fövqəladə gözəlliyi və Züleyxanın ona aşiq olması və həya pərdəsini yırtması dinlər tarixində məşhurdur. Bu əhvalat xüsusən Əbdürrəhman Caminin "Yusif və Züleyxa" poemasında böyük sənətkarlıqla təsvir və hekayə edilmişdir.



## COĞRAFİ ADLARIN İZAHI

Babil – Qədim Babilistanın (indiki İraq) mərkəzi, qədim dünyanın ən böyük abad şəhəri imiş. Fərat çayının hər iki sahilində salınmış bu şəhər indi tamamilə məhv olmuşdur.

Ceyhun – Asiyanın ən böyük çaylarındandır. İndiki adı Amudəryadır. Hindistanın şimalındakı Pamir dağlarından axan bir çox çaylardan əmələ gəlir, şimal-qərbə doğru axır, Aral gölünə tökülür. Ərəblər bu çayın şimalında olan yerləri Məvəraünnəhr adlandırmışlar.

Cəfərabad – Şirazın yaxınlığında təbiəti gözəl bir yerdir. Hafiz buranın havasını bərk tərifləyir.

Xarəzm – Xəzər dənizinin şərqində bu dənizlə Aral gölü və Ceyhun çayı arasında böyük tarixə malik geniş bir ölkə olmuşdur. Qədim yunan tarixçisi məşhur Herodot da Xarəzmdən bəhs etmişdir. Xarəzmin mərkəzi Cörcan şəhəri olmuşdur. Hazırda şimal-şərqi Xivə, şimal-qərbi Üst Yurd, cənubu Qaraqum adlanır.

Xocənd – Vaxtilə Orta Asiyanın məşhur şəhərlərindən biri və müstəqil xanlıq mərkəzi olmuşdur. Bu şəhərdən bir sıra məşhur alimlər və yazıçılar çıxmışdır. O cümlədən məşhur şair Kəmal Xocəndi Hafiz Şirazinin müasiri olmuşdur. Hər iki böyük şairlə durub oturmuş adamlar aralarındakı fərqi göstərərək deyirlər ki, Kəmal Xocəndinin söhbəti şerindən, Hafiz Şirazinin şeri söhbətindən yaxşı idi.

Xütən – Çinə daxil olan Şərqi Türküstanda bir şəhərdir. Gözəl qadınları, əla müşkü və yaxşı ipəyi ilə məşhur olmuşdur.

Kənan – qədim Finikə ölkəsi, Fələstin və indiki Suriyanın bir hissəsindən ibarət bir ölkə olmuşdur. Guya Nuhun nəvəsi Kənan adı ilə adlandırılmışdır. Dinlər tarixində Yəqub və Yusif peyğəmbərlərin vətəni sayılır.

Müsəlla – Şiraz şəhərinin yaxınlığında bir yerdir. Sözün lüğəti mənası namazgah, namaz qılmağa məxsus yer deməkdir. Müsəllaya çıxmaq – quraqlıqda dini nümayiş təşkil edib göydən yağış diləmək. Hafiz Şirazı, Müsəllanın gözəl gəzinti yerini ilhamla təsvir edir.

Rüknabad – Şirazın kənarından axan gözəl, böyük bir çaydır, Hafiz və başqa şairlər bunu şeirlərində tərif etmişlər. Rüknabadın suyu əla, suya lazım olan bir sıra xassələrlə seçilirmiş. 1 – axar su mənbə-

yindən uzağa getməli; 2 – keçdiyi yollarda üstü açıq olmalı; 3 – axdığı yerlər daşlıq və bərk torpaqlı olmalı; 4 – onda ilan, xərçəng, tısbağa, qurbağa, zəli və bu kimi heyvanlar və həşərat olmamalı; 5 – ətrafında əncir ağacı, qoz ağacı, qabaq kimi suyun mizacını dəyişdirən ağaclar və bitkilər olmamalı; 6 – su dik yuxarıdan enişə axmalı. Rüknabad suyu bütün bu keyfiyyətlərə malik olduğu üçün Hafiz onu xüsusilə tərif edir.

Şiraz – İranın ən məşhur və ən gözəl şəhərlərindəndir. Farsın mərkəzidir. Gözəl mövqedə tikilmiş, iqlimi çox gözəl, ətrafında bağ və bağçaları, axar suları çoxdur. Xüsusən qızıl gülləri və gül bağları məşhurdur. Şirazın şərabı əla şərablardan sayılır. Şəhərin içində bir sıra su kanalları var ki, bunların ən gözəli Hafizin tərif etdiyi Rüknabad suyudur. Şiraz Hafiz dövründə müzəffərilərin mərkəzi olmuşdur. Bu şəhərdən Sədi, Hafiz, Ürfi, Qaani kimi böyük şairlər yetişmişdir.

Yəmən – Ərəbistan yarımadasının cənub-qərbində bir ölkədir. Süheyl ulduzu Yəməndə çox parlaq görünür. Yəmənin iri qiymətli dürrü (dürri-Yəmən) məşhurdur.



# LÜĞƏT

## A

**Abi-həyat** – dirilik suyu.

**Aftab** – günəş, məcazi mənada: gözəl, parlaq üz; gözəl, dilbər, camallı məhbubə.

**Ahu** – ceyran; məcazi mənada: gözəl, cazibəli göz; dilbər, məhbubə.

**Amadə** – hazır.

**Asəfi-dövran** – Asəf Süleyman peyğəmbərin vəzirinin ləqəbidir; *Asəfi-dövran* – dövrün məşhur böyüyü, ağıllısı; habelə; Asəfi-zəmanə.

**Aşiyan** – yuva.

## B

**Bad** – külək, yel, ruzigar.

**Baədəb** – ədəbli, mərifətli, mədəni.

**Bal** – qanad, qol; *balu pər* – qol-qanad.

**Bədkar** – pis iş sahibi, pis hərəkətlər edən.

**Bəhrə** – xeyir, hasil, nəticə.

**Bəsirət nəzəri** – qəlb gözü ilə baxış, həqiqəti görən baxış.

**Bəyan** – ifadə, gözəl surətdə bildirmə; *bəyan etmək* – söyləmək.

**Bidəhkar** (bedəhkar) – borclu.

**Biganə** – yad, yabançı.

**Bihasil** – nəticəsiz; bəhrəsiz, meyvəsiz.

**Bürc** – qüllə, qala çıxıntısı; günəşin dövr etdiyi mədarın on iki qismindən hər biri.

## C

**Cah** – dövlət, mənsəb.

**Cahandidə** – qoca; dünya görmüş, təcrübəli.

**Cam** – şərab şüşəsi; qədəh; *cami-Cəm* – Cəm və ya Cəmşidin camı, qədəhi, piyaləsi.

**Cari** – axan; *cari olmaq* – axmaq.

**Cay!** – yerindən çıx!

**Cəng** – müharibə, dava, vuruşma, qovğa.

**Cidal** – qovğa, dava, didişmə, vuruşma.

**Cövhəri-fərd** – bölünməyən ən xırda cisim.

**Cövlan** (və cəvəlan) – dolanma, dönüb dolaşma.

## Ç

**Çahi-zənəxdan** – *çah* – quyu, *zənəxdan* – çənə; şeirdə: gözəllərdə olan çənə çuxurçuğu.

**Çeşmi-xumar** – süzgün göz.

**Çəng** – musiqi aləti.

**Çovkan** (və çovqan) – ucu əyri əl ağacı ki, oyunda işlədilir.

**Çöhrə** – üz, sima, sifət.

## D

**Dar** – ev; məhəllə, yer; dar ağacı.

**Deyr** – kilsə, monastır; *deyri-muğan* – atəşpərəstlərin ibadətgahı, məcazi mənada meyxana, meykədə.

**Dəhən** – ağız; *qönçədəhən* – ağzı qönçə kimi qəşəng olan.

**Dəhr** – dünya, cahan; dövr, əsr.

**Dəni** – alçaq, rəzil.

**Dərgah** – böyüklərin qapısı; xanəgah.

**Dərk** – anlama, fəhm etmə.

**Didə** – göz.

**Dilşad** – qəlbi şad olan, sevincli, qəmsiz.

**Dövr-bər** – ətraf, yan-yörə.

**Dünya və mafiha** – dünya və dünyada olan hər şey.

**Dürd** – çöküntü, xılt.

## Ə

**Əbru** – qaş.

**Əcuzə** – bədxasiyyət qoca arvad; məcazi mənada: dünya – əcuzə dünyamız.

**Əfal** – fellər, işlər, hərəkətlər.

**Əfkar** – fikirlər, düşüncələr, ummalar.

**Əflak** – fələklər, səmalar, göylər.

**Əqiq** – üzük qaşı və möhür kimi şeylər qayırmaqda işlənən qiymətli qırmızı daş.

**Əla** – ey (xitab sözü)

**Əlhökmülillah** – hökm Allahındır, Allahın istədiyi olur.

**Əltaf** – lütflər, yaxşılıqlar, gözəl əlaqələr, xoş rəftarlar.

**Əməl** – iş, hərəkət.

**Ənam** – nemətlər, mükafat, hədiyyə.

**Ənbəri-sara** – xalis, saf ənbər.

**Əndəlib** – bülbül.

**Ərğənun** – körüklə hava vurulub çalınan dilli musiqi aləti; *ərğənunsazi-fələk* – tale, qəza-qədər.



**Ərğəvan** (ərğüvan) – gözəl qırmızı rəngi olan bir çiçək; ərğəvan kimi gözəl parlaq qırmızı rəng.

**Ərməğan** – hədiyyə, töhfə, peşkəş.

**Əshab** – sahiblər; Məhəmməd peyğəmbərə yaxın olmuş adamlar, onunla həmsöhbət olmuş olanlar.

**Əsrar** – sirrlər, gizli işlər.

**Əstəğfirullah** – "Allahdan əfv istəyirəm" mənasında dua kimi ifadədir.

**Əta** – vermə, bağışlama, *əta etmək* – bağışlamaq.

**Əyan** – aşkar, göz qabağında olan, məlum, bəlli.

**Əyyam** – günlər; zaman, dövr.

**Əyyar** – kələkbaz, fırıldaqçı, hiyləgər, aldadıcı.

**Əyyüha** (əyyühə) – xitab olunan adama qarşı nida, xitab sözüdür.

**Əzbəs** – o qədər; *əzbəs ki* – o qədər ki.

**Əzəmət** – böyüklük.

## F

**Fani** – əsası olmayan, müvəqqəti, davamsız, axırı fəna olan.

**Fəqih** – fiqh, şəriət alimi, islam qanunşünası.

**Fəqr** – yoxsulluq, kasıblıq.

**Fələki əla** – əsatirə görə doqquz. fələyin ən yuxarıda olanı, doqquzuncu fələk.

**Fəna** – müvəqqətilik, yoxluq, davamsızlıq, yox olma; *fəna eylədi* – yox etdi.

**Fərağət** – sakit olma, bir işlə məşğul olmamaq, rahatlıq.

**Fəraq** – ayrılıq, hicran.

**Fərzanə** – alim, filosof.

**Fəth** – açma, tutma, zəbt etmə, işğal etmə.

**Firdovs** – cənnət, behişt; *bağı-Firdovs* – cənnət bağı.

**Firqət** – ayrılıq, hicran.

**Fövc** (fovc) – böyük camaat bölüyü, axın.

## G

**Gəda** – yoxsul, dilənçi; nəcabəti olmayan.

**Gərdən** – boyun.

**Güləndam** – bədəni gül rəngində və gül kimi gözəl, dilbər.

**Gülgəşt** – bol gülləri, çiçəkləri olan gəzinti yeri.

**Gülgun** – gül rəngində olan, çəhrayı.

**Gümrah** – yolunu itirmiş; *baxt oldu gümrah* – tale pisliyə tərəf döndü.

**Güzər** – keçmə, ötüb ketmə; *güzər salmaq* – bir yerə gəlib keçmək.

## H

**Hayil** – iki şey arasına girən, pərdə olan.

**Həbib** – dost, aşna, sevimli adam.

**Həclə** – gəlin otağı; yeni evlənənlərin yataq otağı.

**Həkim** – filosof, böyük alim.

**Həmiyyət** – qeyrət, namus; təhqirə, təcavüzə dözməyərək şərəfini mühafizə etmə.

**Hərim** – *girilməsi başqalarına qadağan olan yer; hərimi-hörmət* – möhtərəm adamların mühafizə edildiyi yer.

**Həşr** – qiyamət, qiyamət günü; *həşrədək* – qiyamətə qədər,əbədi.

**Həvalə** – tapşırma, *həvalə eyləmək* – bir işi birinə tapşırmaq.

**Hilal** – aypara, yeni ay; məcazi mənada: gözəlin yeni ay şəklində qaşı, hilal qaşlar.

**Hindu** – hindli; qara; *hindusaç* – qara saç.

**Hüdhüd** – Hophop, şanapipik, şinəbub, Süleyman peyğəmbərdən Bilqeysə xəbər aparıb gətirən quş.

**Hüma** – dövlət quşu, cənnət quşu; əsatirdə: xoşbəxtlik gətirən quş.

**Hümmət** (himmət) – qeyrət, səy; mənəvi yardım, kömək.

## X

**Xacə** – ağa, seyid; müəllim, müdərris.

**Xanəgah** – dərvişlərin olduğu və ibadət etdikləri yer, məkan; bir şeyxin idarə etdiyi təkyə, dərgah.

**Xərabat** – meyxana, meykədə, gələnləri xərab edən işrət yeri.

**Xərac** – *vergi; keçmişdə müsəlman olmayanların əsgər getməmək* üçün verdikləri vergi.

**Xəridar** – satın alıcı, müştəri.

**Xərmöhrə** – eşşək muncuğu; yük heyvanlarının boynuna asdıqları xırda balıqqulağı.

**Xətər** – xata, bəla, təhlükə.

**Xəzan** – payız; *badi-xəzan* – payız küləyi; *xəzan etmək* – soldurmaq.

**Xirqə** – dərvişlərin libası, üst paltarı.

**Xirqəpuş** – xirqə geyən, dərviş.

**Xizab** – boya, rəng; *xizab eləmək* – boyamaq.

**Xosrəvani** – Xosrov Pərvizin Barbəd adlı musiqişünas və xanəndəsinin yaratmış olduğu otuz havadan biri.

**Xunxar** – qaniçən, zalım.

**Xülq** – xasiyyət, təbiət.



## İ

**İxlas** – doğruluq, səmimiyyət, ürək təmizliyi, qərəzsiz hörmət.

**İqamət** – oturma, sakin olma: *iqamət etmək* – hər hansı bir yerdə yaşamaq.

**İqtida** – uyma, tabe olma, bir böyüyün etdiyi kimi etmə.

**İmdad** – kömək, yardım.

**İntibah** – agahlıq; oyanış, oyanma.

**İstiqbal** – gələcək; gəlməkdə olan bir adamın hörmət üçün qabağına çıxma.

## K

**Kaşanə** – yuva, ev, məskən.

**Kibriya** – böyüklük, ululuq, əzəmət.

**Kutah** – qısa, müxtəsər.

**Kuzə** – sovça; *kuzəçilər* – sovça qayıranlar; şeirdə: şərab üçün saxsı qab.

**Küfr** – dinsizlik, imansızlıq, kafirlik.

**Külah** – papaq, börk.

**Külbə** – daxma, evcik.

## Q

**Qafil** – xəbərsiz.

**Qamət** – boy-buxun.

**Qədd** – boy-buxun, qədd-qamət.

**Qədəm** – addım.

**Qəhr** – məhv etmə; zorlama, zorla iş gördürmə.

**Qələndər** – dərviş.

**Qəmxar** – qəm çəkən, dərdli; özgənin dərdini çəkən, kədərinə şərik olan.

**Qəsr** – böyük, bəzəkli bina, imarət, saray kimi ev; *qəsri-firdovs* – cənnət sarayı.

**Qəvi** – güclü, qüvvətli.

**Qəvvas** – qiymətli şeylər və ya batan şeyi çıxarmaq üçün dənizin dibinə enən adam.

**Qiyam** – qalxma; *qiyam etmək* – qalxmaq, ayağa durmaq; qalxışmaq.

**Qüds** – təmizlik, paklıq, müqəddəslik; *gülşəni-qüds* – cənnət güllüyü.

## L

**Leylətül-qədr** – Ramazan ayının 19, 21, 23, 27-ci gecələri ki, Quranda mübarək gecə sayılır.

**Leyli gözlü gecə** – qara, qaranlıq gecə.

**Ləb** – dodaq.

**Ləl** – məcazi mənada: al dodaqlar.

**Ləli-nab** – ləl-yaqut cinsindən qırmızı qiymətli daş; *nab* – saf, xalis; *ləli-nab* – məcazi mənada: qırmızı gözəl dodaq.

**Ləlvəş** – ləl kimi, lələ bənzəyən, qırmızı.

**Löbət** – oyuncaq, oyun; məcazi mənada: gözəl, dilbər.

## M

**Mafiha** – hər nə ki, onda var.

**Masiva** (masəva) – bir şeydən başqa olan şeylərin hamısı; Allahdan başqa olan şeylər.

**Mehr** – məhəbbət, mehribanlıq.

**Mehrab** – məscidin baş tərəfində namaz qılmaq üçün yarımqübbə şəklində yer; – şeirdə: gözəlin qaşları.

**Meykədə** – meyxana, şərab satılıb içilən dükan.

**Meynab** – meyi-nab sözünün yüngül şəkli: saf şərab.

**Mədh** – tərif, öymə, bir adamın yaxşılığını söyləmə.

**Mədhuş** – dəhşətə düşmüş, qorxmuş adam; valeh, heyran.

**Məhliqa** – ay üzlü, gözəl, dilbər.

**Məhvəş** – aya bənzər, üzü ay kimi olan, gözəl, dilbər.

**Məxfi** – gizli.

**Məxmuri-cami-eşq** – eşqin şərabilə xumarlanan.

**Məlal** – qəm, kədər, qüssə.

**Məlikülhac** – Həccə, Kəbəyə gedənlərin böyüyü, rəhbəri.

**Məniş** – təbiət, xasiyyət.

**Məram** – niyyət, məqsəd, arzu, istək.

**Mərəz** – xəstəlik, dərd, azar.

**Məriz** – xəstə, azarlı; *mərizi-eşq* – eşq xəstəsi, aşiq.

**Mərkəb** – minik heyvanı; nəqliyyat vasitəsi; eşşək.

**Məsnəd** – istinadgah, üstünə dayanılan şey; mövqe, böyük mənsəb.

**Məsrur** – şad, sevincli.

**Məstur** – örtülü, pərdə altında olan.

**Mihən** – dərdlər, möhnətlər.

**Mina** – mavi, göy şüşə; büllur şüşə; şərab şüşəsi.

**Möhrəba** – aldadıcı, fırıldaqçı.

**Möhtəsib** – darğa, şəhərin rəisi; şəhər ticarətindən vergi toplayan məmur.

**Muğ** – atəşpərəst, məcusi; məcusilərin ruhanisi; şeirdə: meyxanəçi; məcazi mənada; mürşid, təriqət rəhbəri.

**Muğan** – muğlar, atəşpərəstlər, zərdüştilər.

**Munis** – dost, əziz yoldaş; *munisi-can* – can dostu; ünsiyyət sahibi, istiqanlı adam.



**Müdam** – həmişə, hər vaxt, daima.

**Müddəi** – iddia edən, tələb edən; bədxah.

**Müəmma** – bilməcə, tapmaca; anlaşılmaz söz, iş, düyünlü məsələ.

**Müəttər** – ətirli, çox xoş qoxulu.

**Mürid** – bir pirə xidmət edən və onu izləyən, bir mürşidin şagirdi.

**Müsafir** – yolçu; qonaq.

**Müsahib** – dost, həmsöhbət yoldaş.

**Mustəcab** – xahişi qəbul edilmiş adam; *müstəcab eləmək* – birinin tələbini, xahişini ödəmək, istədiyinə çatdırmaq.

**Müşk** – bir cins ceyran göbəyindən çıxan gözəl qoxulu maddə.

**Mütrib** – zövq məclisində xanəndə, sazəndə, zövq-tərəb verən.

**Mütriba!** – ey mütrib!

## N

**Nab** – saf, xalis, təmiz; *şərabi-nab* – saf, xalis şərab.

**Nafə** – Çində və Xütəndə yaşayan bir cins ceyranın göbəyində olan kisəcik ki, içində müşk əmələ gəlir; məcazi mənada: gözəllərin saçı.

**Nahid** – Zöhrə ulduzu; göyün çalğıçısı.

**Naqabil** – bacarıqsız, qabiliyyətsiz; yaramayan.

**Nay** – qamışdan qayrılan musiqi aləti, ney.

**Nəsrin** – qızıl gülün ağ və yabanı cinsi; buna nəstərə də deyilir.

**Nəva** – ahəng; nəğmə; avaz xoş səs, musiqidə bir məqamın, bir pərdənin adı.

**Nəzarə** – baxma, nəzər salma; *nəzarə eyləmək* – baxmaq.

**Nəzərbaz** – göz-qaş oynadan.

**Nigar** – surət, şəkil: məcazi mənada: şəkil kimi gözəl sevgili.

**Nigəhban** – gözçü, gözətçi.

**Nifaq** – ayrılıq; ziddiyyət; xəyanət, ikiüzlülük.

**Nihan** – gizli, örtülü.

**Nihani** – gizli, gizlicə olaraq.

**Nisar** – saçma, *nisar etmək* – saçmaq.

**Növbənöv** – təzə-təzə, yeni-yeni, təkrar-təkrar.

**Nüktə** – incə və mənalı söz, ifadə.

**Nüsxə** – resept.

**Nüsrət** – kömək, yardım (maddi və mənəvi).

## O

**Ovqaf** – varlının xeyir işlər üçün öz dövlətindən ayırdığı mallar və ya pul.

## P

**Pa** – ayaq.

**Parsa** – zahid, abid; mömin, əməli saleh olan, pəhrizkar.

**Payə** – mərtəbə, dərəcə; əsas, təməl.

**Peyman** – əhd, əhdü peyman.

**Peymanə** – qədəh, piyalə.

**Pər** – qanad; *balü pər* – qol-qanad.

**Pərdə** – musiqidə: aheng, musiqi səsinin təbii halı; səda dərəcələri.

**Pərdədar** – pərdəçi, qapıçı, hərəmxana xidmətçisi; səmanın pərdədarı, məcazi mənada: ay, qəmər; asiman pərdəsinin sahibi.

**Pərvin** – ülkər, yeddi qardaş ulduzların koması.

**Pəyam** – xəbər.

**Pir** – rəhbər, mürşid, böyük təriqət başçısı; qoca.

**Piri-müğan** – şeirdə: meyxanaçı, məcazi mənada: mürşid, doğru yolu göstərən, rəhbər (təriqətdə).

**Pünhan** – gizli.

**Pünhani** – gizli olaraq.

## R

**Ramazan** – orucluq ayı, ərəb aylarının doqquzuncusu.

**Rəxş** – çox sürətlə gedən at; Rüstəm Zalın atının adı.

**Rəna** – gülün sifətidir, bir tərəfi qırmızı, bir tərəfi sarı olan gül; gözəl, lətif, xoş görünən.

**Riad** – laübali adam, kef adamı, hal əhli, xərabati, dərviş xasiyyətli.

**Rizvan** – cənnətin qapıçısı olan mələk.

**Rövzə** – bağça; *rövzeyi-rizvan* – cənnət bağçası.

**Rud** – çay, nəhr; simli musiqi aləti.

**Ruhül-qüds** – böyük mələklərdən biri olan Cəbrail; dini əsatirə görə İsa peyğəmbərin vücuduna üfürülmüş ruh, nəfəs.

**Rübab** – kamançaya bənzər köhnə və tardan bir az kiçik musiqi aləti.

**Rüxsar** – yanaq, üz.

## S

**Sağər** – qədəh, piyalə.

**Saqiya!** – ey saqi! ey şərab paylayan!

**Sara** – saf, xalis, *ənbəri-sara* – xalis ənbər.

**Sarban** – dəvəçi.

**Sayə** – kölgə.



**Səba** – lətif külək, xoş, sərin şimal ruzgarı, səba yeli.

**Səccadə** – namaz qılarkən üstündə səcdəyə düşmək üçün işlənən balaca süfrə.

**Səhba** – qırmızı; şeirdə: badə, şərab.

**Səhvən** – yanlış olaraq.

**Səmavat** – səmalar, göylər, fələklər.

**Səmən** – yasəmən gülü.

**Səmərə** – meyvə, yemiş; hasil, nəticə; fayda, mənfəət.

**Sərraf** – iri pulları xırdalamaqla və ya pul dəyişməklə məşğul olan adam; məcazi mənada: *söz sərrafı* – gözəl, səlis söz söyləyən və elə sözün qədrini bilən.

**Sərv** – şeirdə: uzunboy, uzunboylu gözəl.

**Sərvi-xüraman** – sallana-sallana yeriyən uzunboylu gözəl.

**Səyavuşməniş** – Səyavuş təbiətli, Səyavuş xasiyyətli.

**Səyyad** – ovçu.

**Sidq** – sədaqət, doğruluq, səmimiyyət.

**Sovməə** – ibadətgah, zahidlərin yaşayış yeri, hücrə; vəhdətxanə.

**Sufi** – sufizm cərəyanına mənsub adam, təsəvvüfçü; dinin tələblərindən heç sapmayan adam, zahid, abid.

**Sufiyanə** – suficəsinə, sufi kimi.

**Süheyl** – cənubda görünən çox parlaq bir ulduz.

**Sünbül** – zanbaq fəsiləsindən müxtəlif növləri olan ətirli çiçək; məcazi mənada: gözəllərin saçı, zülfü.

**Sürahi** – şərab şüşəsi.

**Sürəyya** – ülkər ulduzları. *iqdi-sürəyya* – boyunbağıya bənzəyən ülkər.

**Süruş** – xəbər gətirən mələk, Cəbrayılın ləqəbi.

## Ş

**Şahin** – qızılquşun ağ cinsi, *şahin baxışlar* – əzəmətli baxışlar.

**Şam** – axşam.

**Şayəd** – ola bilər ki, ola bilsin ki, ehtimal; əgər

**Şəban** – ərəblərdə qəməri ilin səkkizinci ayı, bundan sonra Ramazan – Orucluq ayı gəlir.

**Şəkərbar** – şəkər yağdıran kimi şirin, dadlı (gülən, danışan).

**Şəqayiq** – iri və parlaq çiçək cinsi; dağ laləsi.

**Şəhd** – bal, *şəhd-şəkər* – bal-qənd.

**Şəhpər** – qanadın ən uzun lələyi və lələkləri.

**Şəm** – şam.

**Şərar** – qığılcım, məcazi mənada: *şərari-ahim* – ahımdan çıxan od.

## T

**Taban** – parlayan, işıq saçan, parlaq.

**Taq** – qübbə, günbəz, günbəd; məcazi mənada; gözəlin qaşı.

**Təbdil** – dəyişmə, dəyişilmə.

**Təcəlla** – parlayıb görünmə, cilalanıb zühur etmə.

**Təfsil** – təfsilat vermə, bir şey haqqında hərtərəfli məlumat vermə, izah etmə.

**Təhsin** – təqdir etmə, mədh etmə, alqışlama, əhsən demə.

**Təkbir** – Allahü əkbər demə, Allahın böyüklüyünü etiraf etmə.

**Təkmil** – mükəmməlləşdirmə.

**Təqrir** – söyləmə, ifadə etmə, bir şeyi şifahi olaraq bildirmə.

**Təqva** – Allahdan qorxub, dincə qadağan işlərdən çəkinmə, möminlik.

**Tənab** – ip, kəndir.

**Təriqət** – dində və sufizmdə kəmala çatmaq yolu; hər hansı böyük bir mürşidin yolu, məsləki.

**Təskin** – sakit etmə, yatışdırma.

**Təzim** – dərindən hörmət etmə, bir adamı böyük sanıb qarşısında ehtiramla hərəkət etmə, əyilmə.

**Təzvir** – hiylə, məkr.

**Tuba** – cənnət ağacı, məcazi mənada: səadət.

## U

**Ud** – musiqi aləti; Hindistanda bitən və yanarkən gözəl qoxu verən bir ağac.

## Ü

**Ülvi** – yüksək, ali.

**Ülviyyət** – ülvilik, alilik, yüksəklik, böyüklük.

**Ümman** – böyük dəniz, mühit; lap çox.

**Ümmülfəsad** – fəsadın anası, fəsad çıxaran, fitnə-fəsada səbəb olan.

**Üşşaq** – aşiqlər, eşqə tutulmuş olanlar.

**Ütarid** – günəşin ətrafında dönən ulduzların günəşə ən yaxın olanı. Mifologiyaya görə Ütarid ulduzu göylərin katibi sayılır.

## V

**Vahi** – boş, əsli olmayan.

**Vaiza!** – ey vaiz!

**Vazeh** – aydın, aşkar, məlum.

**Vəcahət** – vuqarlı gözəllik; gözəl üz.

**Vird** – həmişə və ya müəyyən vaxtlarda oxunan, təkrar olunan sözlər, dua kimi şeylər.



## Y

**Ya** – ey (nida sözü).

**Yaran** – dostlar.

**Yəd** – əl; *yədi-beyza* – ağ əl, Musa peyğəmbərin möcüzəsi sayılan ağ parlaq əl.

**Yəlda** – qışın ən uzun gecəsi, yəlda gecəsi.

## Z

**Zahid** – abid, zöhd və pəhrizlə məşğul olan adam.

**Zar** – zəif, qüvvətsiz; *zarü natəvan* – əldən düşmüş, bacarıqsız.

**Zaval** – zəval olma, yox olma.

**Zəfər** – qələbə, qalibiyyət.

**Zəndərud** (və ya Zayəndərud) – İsfahanda böyük bir çaydır; buna Zəndərud və Rudi-nəsimi-bahar da deyirlər.

**Zöhd** – zahidlik, həyatını ibadətdə keçirmə.

**Zur** – zor, güc.

**Zülal** – təmiz, saf su.

# MÜNDƏRİCAT



HAFİZ ŞİRAZİ

SEÇİLMİŞ ŞEİRLƏR

"ÖNDƏR NƏŞRİYYAT"

BAKI-2004

